# ELMİ İŞ

Azərbaycan Respublikası

Aylıq Beynəlxalq Elmi-nəzəri jurnal

*№ 9 (13)*

# НАУЧНАЯ РАБОТА

Азербайджанская Республика

Ежемесячный Международный

Научно-теоретический журнал

*№ 9 (13)*

# SCIENTICAL WORK

Azerbaijan Republic Amonth International

Science oritical journal's

*№ 9 (13)*

**Bakı – 2009**

# MÜNDƏRİCAT

Dilçilik

# İNGİLİS DİLİNDƏ RİTMİK VARİATİVLİYƏ DAİR BƏZİ QEYDLƏR

**Gülbəniz NURƏLİYEVA,** *Azərbaycan Dillər Universiteti*

Qeyd etmək lazımdır ki, ritm linqvistik bir anlayış kimi seqment və surpaseqment vahidlərlə, o cümlədən səs, heca, söz, söz birləşməsi, cümlə, misra vasitəsilə, başqa sözlə, leksik, sintaktik və prosodik vasitələrlə realizə olunur (8). Ritm əksər hallarda qeyd olunan vahidlərin kombinasiyası ilə özünü təzahür etdirir. Danışıq aktında ritm seqment vahidlərin zəminində əsasən prosodik vasitələrlə realizə olunur. Danışıq aktı, canlı danışıq təbii olaraq nəfəs alıb-vermə prosesi ilə sıx bağlıdır. Belə ki, danışıq fəaliyyəti, eləcə də insanın hər bir digər fəaliyyəti fizioloji faktorlarla şərtlənir və onların arasında bəziləri ritmik səciyyəlidir. Danışıq aktında, canlı danışıqda ritmin ti-pi dillərdən asılı olur. Bu baxımdan linqvistlər dilləri iki qrupa bölürlər: 1) he-calı ritm tipi; 2) vurğulu ritm tipi. Hecalı ritm tipində danışan şəxs (dil daşıyıcısı) hecaların vurğulu və vurğusuz olmasından asılı olmayaraq, hər bir hecanın tələffüzünə təqribən bərabər vaxt (zaman) sərf edir və bu da dinləyicidə qırıq-qırıq ritm təəssüratından çox bərabərsəviyyəli ahəstə ritm təssüratı yaradır. Hecalı ritm tipinə fransız, ispan, o cümlədən Azərbaycan dili aid edilir.

Vurğulu ritm tipi hecadan böyük olan vahidə əsaslanır. İngilis, alman, rus dilləri vurğulu ritm tipinə aid edilir. İngilis dilində minimal ritmik vahid heca deyil, ritmik qrup hesab edilir. İngilis dilində bir vurğulu heca (söz) ətrafına vurğusuz hecaları (sözləri) birləşdirərək bir ritmik qrup yaradır. Vurğulu ritm tipində hər bir hecanın tələffüzünə verilən vaxt (zaman) kifayət qədər variativləşir, ancaq hər bir ritmik qrupun tələffüzünə sərf olunan vaxt (zaman) praktik olaraq dəyişməz qalır. Belə ki, ritmik qrupların vurğulu hecaları qabarıqlıq zirvələri yaradır və ritmik qrupların vurğulu hecaları, onlar arasında vurğusuz hecaların sayından asılı olmayaraq, bərabər zaman intervalında tələffüz olunmağa meyillidir. Ritmik qruplar daxilində zamanın distribusiyası qeyri-bərabərdir və variativ səciyyəlidir. Odur ki, danışıq aktında ritm (müntəzəmlilik) əsasən güclü zərbə axınları ilə, yəni ritmik qrupların vurğuları ilə özünü büruzə verir. Belə ki, danışıq prosesində belə nizamla, müntəzəm vurğulu ritm zərbələrinin müəyyən zaman intervalında birinin digəri ilə növbələşməsi, əvəzlənməsi dəqiq, kəskin və şiştəpəli «ritm effekti», təəssüratı yaradır (4, 164).

Qeyd etmək lazımdır ki, ritmik qruplarda vurğulu hecaların bərabər zaman intervalında əvəzlənə bilməsinə səbəb vurğusuz hecalardakı saitlərin

variativ səciyyəli olmasıdır. Vurğusuz hecalarda saitlərin variativliyi özünü reduksiya və eliziya formasında göstərir. Reduksiya kəmiyyət keyfiyyət və sıfır formasında baş verir. Saitlərin variativliyi canlı danışıqda məna qruplarının ritmik strukturunda mühüm əhəmiyyət kəsb edir. Belə ki, saitlərin uzunluğu söyləmin tempinə təsir edir. Belə ki, söyləmlərin sürəti artdıqca saitlərin uzunluğu azalır, saitlərin uzunluğunun artması və azalması bir növ nitqin ritmini nizamlayır.

İngilis dilində saitlər fiziki baxımdan iki mühüm əlamətlərlə səciyyəvidir. Belə ki, kəmiyyət və keyfiyyət sait fonemləriniki xarakterik xüsusiyyətidir. İngilis dilində saitlər yanlız kəmiyyətə görə fərqləndirici əlamətin daşıyıcısı kimi çıxış edə bilmir, çünki saitlərin kəmiyyət parametri müxtəlif fonetik kontekstlərdə variativliyə məruz qalır. Məsələn, see – seen; sease; my – mine – mice sözlərində uzun [i:] və [aı] saitlərinin uzunluq dərəcəsi eyni deyildir. İngilis dilində saitlərin, ritmik variativliyinə təsir göstərən bir sıra amillər vardır.

İngilis dilində ritmik variativliyə səbəb amillərdən biri və əsası, demək olar ki, vurğudur. İngilis dilində mühüm prosodik vasitə olan vurğu, onun yeri və dərəcələri sözlərdə saitlərin kəmiyyət və keyfiyyət baxımından variativliyinə səbəb olur. Eyni bir sözdə vurğunun yerindən asılı olaraq saitin uzunluğu variativləşir. Məsələn, 'import ['ımpб·t] sözündə [б:] saitinin uzunluğu ilə im'port [ım'pб:t] sözündəki [б:] saitinin uzunluğu arasında fərq vardır. İngilis dilində vurğu, onun yeri və dərəcələri ilə fərqlənən söz formalarında (nitq hissələri) saitlərin ritmik variativliyi özünü aydın şəkildə büruzə verir. İngilis dilində sözlərin əsas və ikinci dərəcəli vurğusundan bəhs edərkən A.S.Qimson qeyd edir ki, vurğulu hecalar arasında biri digərlərinə nisbətən səs fonunun dəyişməsi ilə əlaqədə olur, digəri (digərləri) isə tonun dəyişməsi ilə əlaqəsi olmur. Məsələn: examination [ıq,z5mi-'neı3n]. Bu halda aksentual qabarıqlıq yalnız əsas vurğunun özü ilə əldə edilir. Bu qəbildən olan vurğunu o, əsas, nüvə, yaxud tonik adlandırır, ikinci dərəcəli vurğunu isə o, ikinci dərəcəli, ritmik, yaxud qeyri-tonik adlandırır. A.C.Qimsona görə, əsas vurğulu hecada realizə olunan səs dəyişməsi rabitəli nitqdə itə bilər, yəni qeyri-tonik ola bilər (1, 224).

The ,examination was 'almost ˌover.

İngilis dilində çoxhecalı sözlərdə ikinci dərəcəli vurğu (vurğular) əsasən ritmik amilin təsiri ilə bağlıdır. İngilis dilində ritmik meyil, çoxhecalı sözlərdə ikinci dərəcəli vurğunun (vurğuların) işlənməsini nəzərdə tutur və çoxhecalı sözlər daxilində vurğulu hecaların müəyyən zaman intervalında əvəzlənməsini, bununla da vurğulu hecalar arasında zaman intervalının bərabərliyini nizamlamaq məqsədini güdür. Belə ki, ikinci dərəcəli vurğu saitlərin, kəmiyyət və keyfiyyət baxımından əsas vurğuya və digər vurğusuz hecalara nisbətdə variativliyini yaradır və bununla da, sözlərin ritmik-prosodik baxımdan nizamlayır. Ayrılıqda götürülmüş sözlərdə əsas vurğu, A.S.Qimsonun qeyd etdiyi kimi, səs tonunun potensial dəyişməsi ilə

əlaqədarsa, ikinci dərəcəli vurğu adi halda səs tonunun dəyişməsi ilə əlaqədar deyildir. İkinci dərəcəli vurğu səs tonunun səviyyəsinin potensial dəyişməsini siqnal edir və ritmik vurğu ilə bağlı olur və əksər hallarda saitlərin kəmiyyət və keyfiyyət dəyişmələri ilə səciyyəvi olur. Vurğu və səs tonunun variativliyi mürəkkəb birlik təşkil edir və sözlərdə vurğunun dərəcələrini siqnal edir ki, bu da sözlərdə saitlərin ritmik-prosodik variativliyini reallaşdırır. Qeyd etmək lazımdır ki, sözlərdə vurğu onun dərəcələri və səs tonunun dəyişməsi ilə hecalara, səslərə verilən nisbi qabarıqlıqla yanaşı, səslərin özlərinin də özlərinə xas müəyyən fiziki keyfiyyətləri də vardır ki, onlar da qabarıqlığın artmasına müəyyən təsir göstərir. Normal halda saitlər samitlərə nisbətən qabarıqlıq yaradır. Saitlər arasında da açıq saitlər daha çox qabarıqlığa malikdir. Belə ki, saitin açıqlığı artdıqca qabarıqlıq da artır. Samitlər arasında [m, n, 2, l, r] samitləri daha yüksək qabarıqlığa malikdir. Sürtünən samitlər partlayışlılara nisbətən yüksək qabarıqlığa malikdir. Əgər mənası olmayan qısa saitlərdən və samitlərdən ibarət səs ardıcıllığını vurğusuz və tonsuz halda ingilis dinləyicisinə təqdim edilərsə [ıl6lel5], bu zaman dinləyicilər [ɒ] və [5] saitlərinin yüksək qabarıqlığa malik olduğunu söyləyəcəklər (1, 226). Səslərin qabarıqlığının dərəcəsi onların düşdüyü fonetik konteksdən və digər amillərdən asılı olur. Məsələn, ingilis dilində [ə] saiti normal halda vurğulu hecada gələ bilmir. [ı, u] saitləri isə, baxmayaraq ki, vurğulu mövqedə yüksək qabarıqlığı ola bilər, vurğusuz mövqedə daha çox işlənmə tezliyinə malikdir. Digər fonemlər isə vurğu qəbul etməyən hecalarda gələ bilər. Məsələn: refree |ˌrefə'ri: |, canteen |ˌk5n'ti:n|, detail |'di:teıl|, abstract ['5bstr5kt] (n), |ˌ5bśtr5kt|, record |'rek6:d|, nephew |`nevju:|.

Bu qəbildən olan sözlərdə saitlərin keyfiyyət baxımından tam formasını saxlaya bilməsindən bəhs edən A.S.Qimson yazır ki, belə sözlərdə danışanın və dinləyənin beynində bu, ritmik meyildən irəli gələn ikinci dərəcəli vurğu ilə əlaqədardır (1, 225). Digər tərəfdən, vurğusuz vəziyyətdə [ə] saitinin [z] və [d] qarşısında qismən uzadılması (teachers [ti:t37·z], answered [ɑ:nsə·d]) saitin ritmik-prosodik variativliyinə dəlalət edir. Bu deyilənlərdən belə nəticəyə gəlmək olar ki, vurğusuz mövqelərdə uzun və qısa saitlərin tam formasını saxlamasına, habelə [ə] saitinin vurğusuz mövqedə uzadılmasına saitlərin ritmik variativlik kimi baxmaq olar. İngilis dilində saitlərin uzunluğu mövqedən və digər amillərdən asılı olaraq variativləşir. Araşdırmalar göstərir ki, ingilis dilində dörd və daha çox hecası olan sözlərdə, bəzən ikinci dərəcəli vurğu işlənir. İngilis dilində iki ikinci dərəcəli və iki əsas vurğuya səkkiz (1, 230) və doqquzhecalı sözlərdə (3, 18) rast gəlinir. Məsələn: ˌinterˌnationali'zation (8 heca), 'extraˌterriˌtori'ality (9 heca)

İngilis dilində çoxhecalı sözlərin aksent quruluşunu nəzərdən keçirdikdə aşkar olur ki, ingilis dilində sözlərin vurğulu və vurğusuz hecaların növbələşməsində müəyyən bir ritmik meyil özünü göstərir (1; 3). Lakin bir sıra hallarda sözləri müşayət edən nizamlı aksent-ritmik model

sözdə müəyyən prefikslərə verilən məna qabarıqlığı sayəsində tez-tez pozulur.

Belə ki, qüvvətli prefikslərdə qüvvətli vurğunun olması saitlərin keyfiyyət və kəmiyyət baxımından tam formasını saxlaması ritmik modeldə dəyişkənlik yaradır (1, 230). Məsələn, 're'organization, 'ex'minister, 'pre'mar, 'misbe'have kimi sözlərdə rtmik baxımdan dəyişmələr baş verir. Lakin cümlə daxilində bu qəbildən olan sözlərin ritmik strukturu cümlənin ritmik-melodik strukturuna uyğun nizamlanır. İngilis dilində ikihecalı mürəkkəb isimlərdə birinci heca (söz) əsasən vurğulu olur (air-raid, 'backache, bookcase, heartburn və s.). Üç və daha çox hecalı isimlərdə əsas və ikinci dərəcəli vurğuların yeri müxtəlif və dəyişkən olur. Məsələn: 'booking ,office, black 'currant, ,hot 'water ,bottle (1, 230-231).

Bu qəbildən olan sözlərdə vurğuların yerinin dəyişməsi saitlərin kəmiyyət və keyfiyyət baxımından ritmik variativliyini yaradır bu da həmin sözlərin düzgün qavranılmasına və mənalarının başa düşülməsinə artikulator-akustik zəmin yaradır. A.S.Qimsona görə, iki hecadan çox olan bəzi sözlərdə zəif heca ardıcıllığından, xüsusilə tərkibində [ə] və [ı] olan hecalardan, yaxa qurtarmaq meyilliyi nəzərə çarpır və bu qəbildən olan sözlərdə ritmik dəyişmə – variativlik özünü göstərir (1, 232-233). Məsələn: integral [íntıgrəl] – [ın'tegrəl] ; hospitable ['h6spıtəbl] – [həs'pıtəbl]; capitalist ['k5pıtəlist] – [kə'pıtəlıst]; formidable [f6:mıdəbl̦] – [f ə'mıdəbl̦] və s.

Bunlardan əlavə, nisbətən uzun sözlərdə vurğulu və vurğusuz hecaların müxtəlif düzümdə növbələşməsi müxtəlif ritmik moldellərə – variativliyə gətirib çıxarır. Məsələn, «articulatory» sözündə üç ritmik variativ model müşahidə edilir: [ˌɑ:tıkju'leıtərı], [ɑ:(ə)ˌtıkju'leıtərı] - [ɑ:(ə)'tıkjuleıtərı] (1, 233).

Bir çox sözlərdə ritmik variativlik anoloji aksent model əsasında baş verir. Məsələn, apply [ə'plaı], prefer [prı'f8:], compare [kəm`pɛə] sözləri sifət kimi işləndikdə vurğu birinci hecaya keçdiyi halda ['5plıkəbl], ['prefərəbl], [k6m'p5rəbl], kök formaya əsaslanaraq, həmin sözlərdən törəyən sifətlər [ə'plıkəbl], [prı'f8:rəbl], [kəm'p5rəbl] kimi realizə olunur. Analoji aksent model digər sözlərin aksent-ritmik strukturunda müşahidə edilir. Məsələn, contribute [kən'trıˌbju:t], distribute [dıs'trıˌbju:t] sözləri təsadüfi hallarda ['k6ntrıˌbju:t], [dıstrıˌbju:t] kimi, həmin feldən törəyən isimlər isə contribution [ˌk6ntrı'bju:3n], distribution [ˌdıstrı'bju:3n] kimi aksent-ritmik struktura malikdir.

İngilis dilində bir qrup ikihecalı sözlər vardır ki, onlarda vurğuların yeri dəyişdikdə sözün qrammatik formaları dəyişir. Bu qəbildən olan sözlər iki əsas hissədən ibarətdir: prefiksdən və kökdən. Belə ki, əsas vurğu prefiksin üzərində olanda həmin söz isim kimi, kökün üzərində olanda isə həmin söz fel kimi çıxış edir. Digər tərəfdən, bəzi isimlər və fellər vurğuların prefiksdə və kökdə saxlamaqla həm də sifət kimi çıxış edə bilir (3, 45).

Qeyd etmək lazımdır ki, vurğunun yerinə görə fərqlənən söz formaları ikihecalı olmasına baxmayaraq, bu qəbildən olan sözlərdə ritmik meyl özünü əsaslı şəkildə göstərir. Bu sözlərdə ritmik prinsip iki aksent-ritmik modeldə özünü göstərir: 1) [ ⊥ ⊤ ] 2) [— ⊥ ]. Birinci aksent-ritmik struktur isimlər, ikinci isə fellər üçün səciyyəvidir. Məsələn: combine ['k6m,baın] (i), [kəm'baın] (f); increase ['ın,kri:s] (i), [ın'kri:s]; abstract ['5b,tr5kt] [əb'str5kt]. Vurğunun yerinə görə fərqlənən ikihecalı söz formaları içərisində elə sözlər vardır ki, onlarda vurğunun yeri dəyişmir, yəni hər iki söz forması üçün eyni aksent-ritmik struktur forma işlənir. Məsələn: 'comment (n) `comment (f) 'detail (n) `detail (i) (1, 238).

Bu qəbildən olan söz formaları çox azdır. İngilis dilində ikihecalı sözlərdən əlavə, bir qrup üçhecalı sözlər də vardır ki, onlarda vurğunun (vurğuların) yeri və dərəcəsi fərqləndirici rola malik olur (1, 236). Bu qəbildən olan sözlərin aksent-ritmik quruluşu vurğunun yeri ilə fərqlənən ikihecalı söz formalarının aksent-ritmik quruluşundan fərqlənir. Belə ki, üçhecalı sözlərdə – isimlərdə əsas vurğu əsasən birinci hecaya düşür [ ⊥ — — ] üçüncü hecalar çox az hallarda ikinci dərəcəli vurğu səciyyəvi olur: [ ⊥ — ⊤ ]. Məsələn: compliment ['k6mplımənt], estimate ['estımət]; interchage ['ıntə,t3eınd=]; repremand ['reprı,mɑ:nd]. Bu qəbildən olan sözlərin fel formalarında isə ikinci dərəcəli vurğu əsasən birinci hecada əsas vurğu isə ikinci üçüncü hecada olur və müəyyən hallarda əsas vurğu birinci hecaya keçir. [ ⊤ — ⊥ ], çox az hallarda [ ⊥ — ⊤ ] bu aksent-ritmik strukturla səciyyəvi olur. Məsələn: compliment [,k6mplı'ment], estimate ['estımeıt] və s. Qeyd etmək lazımdır ki, söz səviyyəsində saitlərin eliziyası da vurğusuzluq mövqeyi ilə əlaqədar olub, ritmik meyildən irəli gəlir və nəticə etibarilə saitlərin ritmik-prosodik variativliyi kimi özünü göstərir. Müqayisə et: murderer ['m8:d7r7 – 'm8 • - dr7]; difficult [dıfikəlt -'dıfklt] və s.

Söz vurğusu səviyyəsində aparılan təhlil göstərir ki, sözlərin müxtəlif mövqelərdə baş verən prosodik dəyişmə ilk öncə onların aksent quruluşuna, aksent quruluşu ilə birgə onların ritmik təşkilinə, eləcə də prosodik vasitələrin dəyişməsinə təsir göstərir ki, bu da saitlərin kəmiyyət və keyfiyyət, o cümlədən ritmik baxımdan variativliyinə dəlalət edir.

İngilis dilində uzun və qısa saitlərin oppozisiyası əsasən eyni fonetik əhalədə (pool-full, beat-bit, bark-buck, court-cot, nought-not və s.) məqbul hesab edilir. Digər hallarda uzun saitlər fonetik və digər amillərdən asılı olaraq variativləşir. Məsələn, «refuse» sözündə vurğulu mövqedə olan [u:] vurğusuz mövqedə olan [u:] -dan uzunluğuna görə fərqlənir. Müqayisə et: refuse ['refu:s] (isim), refuse [rı'fju:z] (fel). Bu söz formaları yalnız [s] və [z] qarşılaşmasına görə deyil, həm də ikinci [u:] saitinin uzunluğuna görə fərqlənir (1, 235). Uzun saitlərin ritmik variativliyi ilə müşayət olunan bu uzunluq aksent uzunluq kimi xarakterizə olunur (7, 45).

Aksent uzunluqla sıx bağlı ritmik uzunluq isə sözlərdəki hecaların

kəmiyyətcə uzanması və qısalmasını nəzərdə tutur. Məsələn: sonorous [sɒnərəs] – [sə'nɔ:rəs]; formidable ['fɔ:mıdəbl] – [fə'mıdəbl]; applicable ['ɔplıkəbl] – [ə'plıkəbl]; inapplicable [ˌın'ɔplikəbl̩] – ['ınə'plıkəbl] (7, 45).

Bu sözlərdən birinci variantında vurğulu monoftonqların vurğulu, ikinci variantda həmin saitlərin uzunluğundan təxminən iki dəfə artıqdır. İngilis dilində sözlərdə hecaların sayından, hecaların açıq və qapalı olmasından asılı olaraq uzun saitlər variativləşir. Məsələn, sea [si:], seas [si:z] söz formalarında birinci heca açıq olduğundan [i:] saiti uzun, [si:z] sözündə heca qapalı olduğundan [i:] saitinin uzunluğu nisbətən qısa olur, yəni variativləşir. Digər tərəfdən, ask – asking [ɑ:sk-'ɑski2] sözlərində olan [ɑ:] saitinin uzunluq dərəcəsi eyni deyildir. Belə ki, ask sözündə [ɑ:] saiti təkhecalı söz tərkibində çıxış etdiyindən uzun, asking sözündə isə ikihecalı söz tərkibində çıxış etdiyindən nisbətən qısa tələffüz olunur, yəni variativləşir. Sillabik uzunluq adlanan bu uzunluq da, fikrimizcə, saitldərin ritmik variativliyini reallaşdıran bir fonetik amildir (7, 45). Bununla yanaşı, uzun saitlərin variativliyinə təsiredən amillərdən biri də uzun saitlərdən sonra gələn samitin fiziki xüsusiyyətidir. Kombinator uzunluq adlanan bu hadisə heca daxilində uzun saitlərdən sonra gələn samitin kar və cingiltili olmasını nəzərdə tutur. Məsələn, feed – feet sözlərində birinci [i:] saitinin [fi:d] uzunluğu təqribən ikinci [i:] saitinin [fi:t] uzunluğundan bir dəfə yarım çoxdur (7, 45).

Söz səviyyəsində müxtəlif fonetik amillərin təsirindən saitlərin kəmiyyət və keyfiyyət baxımından dəyişmələri, o cümlədən aksent, ritmik, sillabik, kombinator uzunluq və s. sözlərin ritmik strukturunu nizamlayan rtmik-prosodik variativlikdən başqa bir şey deyildir.

Sözlərdə vurğulu və vurğusuz hecaların müntəzəm növbələşməsi baş verdiyi kimi, cümlələrdə də vurğulu hecaların müəyyən zaman intervalında əvəzlənməsi baş verir. Belə ki, ingilis dilində sözlərdə və cümlələrdə ritmik baxımdan eyni meyil özünü göstərir. Lakin cümlə daxlində sözlərin aksent-ritmik strukturu, o cümlədən saitlərin ritmik-prosodik variativliyi sözlərdə olan ritmik-prosodik variativlikdən formaca fərqlənir. Məsələn, ikihecalı söz olan compact [kəm'pɔkt] (sifət) sözündə birinci hecada [ə] saiti işlənir, lakin həmin sözdə birləşməsi daxilində vurğu birinci hecaya keçir ('compact 'disc). Bu zaman birinci hecada [ə] saiti [ɒ] saiti ilə əvəzlənir. Digər tərəfdən, [pɔkt] hecasında olan [ɔ] vurğusuz vəziyyətdə tam formada işlənsə də, vurğulu mövqedə olan [ɔ] saitindən keyfiyyətcə müəyyən dərəcədə fərqlənir. Bu qəbildən olan ritmik-prosodik variativliyi 'thirteen 'places, 'Westminister Abbey və s. birləşmələrdə müşahidə etmək olar.

İngilis dilində iki əsas (bərabərsəviyyəli), bir ikinci dərəcəli və bir əsas vurğuya malik olan sözlərin aksent-ritmik quruluşu cümlə daxilində variativləşir və bunun müqabilində də həmin sözlərin tərkibində olan saitlərin ritmik-prosodik variativliyi fərqli baş verir, yəni söz səviyyəsində olan ritmik-

prosodik variativlik cümlə daxilində mövqe baxımından fərqlənir. Məsələn, 'fourteen, 'unk'nown, ˌconver'sation', home-'made, ˌdiplo'matic və bu qəbildən olan sözlərin aksent-ritmik strukturu cümlə daxilində ritmik amilin təsirindən variativləşir, eyni zamanda həmin sözlərin tərkibində olan saitlərdə kəmiyyət və keyfiyyət baxımından dəyişmələr baş verir, başqa sözlə, saitlər ritmik-prosodik baxımdan variativləşir. Müqayisə edək: 'fourteen – there were 'fourteen ˎmen there; 'un'known – he was an 'unknown ˎpoet; conver'sation – when I entered the ' conversation ˎstopped; 'home-'made; Help yourself to the cake. They are 'home made ˎcake; ˌdiplo'matic – A 'diplomatik 'mission was ˎsent there və s.

İngilis dilində ritmik meyilin təsiri özünü cümlədə adətən vurğu daşıyan avtosemantik sözlərdə göstərir. Məsələn: He 'ment a ˎway. 'John went aˎway. I 'agree with what you ˎsay. I 'quite agree with what you ˎsay (7, 4).

Yuxarıda qeyd edildiyi kimi, sözlərin ritmik təşkili ilə cümlələrin ritmik təşkili heç də həmişə eyni deyildir. Cümlədə ritmik qrupların xarakteri əsasən sözlər arasında semantik və qrammatik münasibətlərlə və müəyyən dərəcədə də fonetik (hecalarla) amillərlə nizamlanır. Belə ki, sözlərin səs tərkibi şeca tipi, saitlərin uzun və qısa olması, heca (söz) qovşuğında samitin çoxluğu ritmik qrupların xarakterinə, o cümlədən saitlərin ritmik-prosodik variativliyi ilə müşayət edilir. Məsələn, buy the book cümləsində müəyyən artikl isim ilə sıx bağlı olduğundan ritmik baxımdan ona bağlanır və bu halda buy sözündə [aı] diftonqunun uzunluğu artır. Lakin take it out cümləsində it əvəzliyi fellə sıx əlaqədə olduğundan ritmik baxımda ona bağlanır. Qrammatik baxımdan analoji cümlədə – take them out – them əvəzliyi ritmik baxımdan ikinci sözə (them out) bağlanır. Belə ki, birinci iki sözün qovşağında samit çoxluğu özünü göstərir (take them) (7, 8-9).

Qeyd etmək lazımdır ki, eyni qrammatik quruluşlu və əsasən eyni leksik tərkibə malik olan cüilələrdə sözlərin bir-birinə ritmik bağlılığı müxtəlif ola bilər. Bu müxtəliflik də öz növbəsində saitlərin cəmiyyət və keyfiyyət baxımından ritmik-prosodik variativliyinin müxtəlifliyinə dəlalət edir. Məsələn:

a. They were 'laughed at / nearly ˋ everywhere.

b. They were laughing / at nearly ˋeveryone.

Birinci cümlənin (a) birinci ritmik qrupunun vurğulu hecasında olan [ɑ:] saitinin uzunluğu ilə, ikinci cümlənin (b) birinci ritmik qrupunda vurğulu hecasında olan [ɑ:] saitinin uzunluğu eyni deyildir. Belə ki, birinci (a) [ɑ:] saiti təkhecalı söz daxilində işləndiyindən uzun, ikinci (b) [ɑ:] saiti ikihecalı söz daxilində işləndiyindən nisbətən qısa tələffüz olunur. Digər tərəfdən, *at* sözü də birinci halda (a) laughed sözünə, ikinci halda (b) nearly sözünə bağlanır. Enklitik və proklitik münasibətdə olan «at» sözünün tərkibində olan [5] saitləri də fikrimizcə, ritmik bölgüdən asılı olaraq, keyfiyyətcə

fərqlidir. Belə ki, ikinci (b) [5-ə] nisbətən birinci (a) [5], fikrimizcə, daha aydın tembrə malikdir.

Beləliklə, araşdırmalar və aparılan təhlil göstərir ki, ingilis dilində ritmik variativlik bir sıra amillərdən asılı olur. Ritmik variativlik əsasən saitlərlə onların gəldiyi vurğulu hecalarla bağlı olur. Belə ki, ingilis dilində saitlərin hər birinin özünəməxsus uzunluğu vardır. Bununla belə, saitlərin uzunluq dərəcəsi onların gəldiyi mövqedən, hecanın açıq və qapalı olmasından, saitin təkhecalı və çoxhecalı sözlərdə gəlməsindən, saitin vurğulu və vurğusuz hecada dayanmasından, vurğunun dərəcəsindən, saitin sadə və mürəkkəb, dar və geniş diapazonlu tonlar altında deyilişindən asılı olur. Bu amillərlə yanaşı, saitlərin uzunluğunun variativliyinə onların ritmik strukturunda, söyləmdə yeri, söyləmin ümumi tempi, tələffüz üslubları, nitqin növləri və müxtəlif funksional üslublarının intonativ xüsusiyyətlərindən asılı olur.

**Ədəbiyyat:**


1. Gimson A.C. An introduction to the pronunciation of English. London, 1970.
2. Roach P. English phonetics and phonology. Cambridge, 2000.
3. Kingdon R. The groundwork of English stress. London, 1958.
4. Sokolova M.A. English phonetics. (A theoretical course). M., 1996.
5. Vassilyev V.A. English phonetics (A theoretical course). M., 1970.
6. Vassilyev V.A. English phonetics. M., 1980.
7. Торсуев Г.П. Вопросы акцентологии современного английского языка. М., 1960.
8. Антипова А.М. Ритмическая система английской речи. М., 1984.



**SUMMARY**

**SOME NOTES ON RHYTHMIC VARIATIONS IN ENGLISH**

The article deals with the rhythmic variations of vowel sounds in different positions. In the article an attempt is made to determine phonetic factors that cause rhythmic variations within the words and utterances in English speech.

**РЕЗЮМЕ**

**ЗАМЕТКИ ПО РИТМИЧЕСКИМ ВАРИАТИВНОСТЯМ В АНГЛИЙСКОМ ЯЗЫКЕ**

В статье рассматриваются ритмические вариации гласных в разных позициях. В ней сделана попытка для определения факторов, которые действуют на ритмические вариации.

# İSPAN DİLİNDƏ FRAZEOLOJİ BİRƏŞMƏLƏRİN AZƏRBAYCAN DİLİNƏ TƏRCÜMƏ YOLLARI

**Lalə İBADOVA,** *Azərbaycan Dillər Universiteti*

Hər bir dilin özünəməxsus xarakterlərinin olması həmin dilin keçdiyi tarixi, mədəni , məişət dəyişiklərindən asılıdır. Onun məxsus olduğu xalqın yaşadığı bəzən adi cografi xüsusiyyətlər belə dilin strukturuna güclü təsir edə bilir,xüsusən də bu özünü frazeoloji birləşmələrdə öz əksini tapır.

İspan dilinin daxil olduğu roman-german dillərini hind avropa dillərindən fərgləndirən əsas xüsusuiyyətlərdən biri burada feli birləşmələrin özünəməxsus mürəkkəb və başqa heç bir dildə rast gəlinməyən xüsusiyyətlərinə malik olmasıdır.

Azərbaycan dilində də həmin felli birləsmələrin ispan dilindən tərcüməsi zamanı dilimizin zəngin grammatik ifadələrindən və feli birləşmələrindən istifadə etməklə düzgün mənanı ifadə etmək olur.

Frazeoloji birləşmələr quruluşuca daha mürəkkəb və möhkəm dil vahdlərini öyərənən dilçilik bölməsidir. Bir cox tədqiqarçılar Ramon Kabayyero, Qonsalo Korreas və s. söz birləşmələri sərbəst və sabit söz birləşmələri olaraq iki yerə bölünürlər. Sərbəst söz birləşmələrini təşkil edən sözlər söz birləşməsi tərkibində öz ilkin mənasını qoruyub saxlayırlar, ondan uzaqlaşmırlar. Sabit söz birləşmələrinin tərkibinə daxil olan sözlər isə öz ilkin mənasından təmamilə uzaqlaşıb söz birləşməsi tərkibində yeni məna kəsb edirlər, yəni sabit söz birləşməsini yaradan sözlərdən bir digərindən mənaca asılı olub, bir birilərini tamamlayırlar. Sabit söz birləşmələri isə frazeoloji birləşmələri adlanır.

Ilk dəfə frazeolji birləşmələrin sistemləşdirilməsiylə məşğul olan dilçilər onları iki əsas qrupa bölürlər: frazeoloji birləşmələr və frazeolji vahidlər. Söz birləşmələri ifadəni daha emosional edə, ona mənalılıq , səlislik qata bilərlər. Bu birləşmələrə atalar sözləri, məsəllər, sitatlar və s. aiddir.

Frazeologizmləri başqa leksik vahidlərdən fərqləndirən bir sıra xüsusuiyyətlər vardır. Belə ki onlar tərkibinə görə daha mürəkkəb olub bir neçə komponentin birləşməsi nəticəsində yaranır. Bu komponentlər öz sərbəst vurğusunu saxlasa da ilkin mənasını itirirlər.

Frazeologizmlər semantik cəhətdən ayrılmaz olurlar. Məsələn: cayrsele a uno el alma a los pies (h.t.-birinə canı ayaqlarına düşmək) – birinin kefi pozulmaq, qanı qaralmaq, qanadı, qolu qırılıb yanına düşmək

Al tenorio se le cayu el alma a los pies. Pero no ceju.-Şorgöz kişinin ürəyi düşdü. Amma özünü o yerə qoymadı.

J.R. Gamecho: "La jltima encrucijada"

"Ürəyi düşmək" frazeoloji birləşməsi qorxmaq mənasını verən bir tək anlayışı ifadə edir. Lakin elə frazeoloji birləşmələr də var ki, onlar sərbəst söz birləşmələrinin obrazlı ifadəsinin nəticəsi kimi meydana çıxır. Buna görə də onları tək bir sözlə izah etmək mümkün olmur. Məsələn:

var-yoxdan çıxmaq- bütün sərvətini itirmək. Frazeologizmlər sabit söz birləşmələri kimi onunla fərqlənirlər ki onu təşkil edən sözləri mənaca yaxın sözlərlə əvəz etmək olmaz. Baxmayaraq ki, sərbəst söz birləşmələrində bu əməliyyatı həyata keçirmək heç bir maneçilik törətmir. Məsələn: Məsələn: comer oreja (h.t.-qulaq yemək) – həyacan keçirmək, narahat olmaq. Bu sabit söz birləşməsində oreja sözünü ona yaxın mənalı "oido" sözüylə əvəz edə bilmərik.

Sərbəst söz birləşmələri danışıq zamanı meydana gəldiyi halda frazeoloji birləşmələr artıq hazır bir halda istifadə olunur. Onlar dildə müəyyən dəyişikliklərə uğrayaraq sabit formasını alır və danışıqda bir formada istifadə olunurlar.

Frazeoloji birləşmələrin komponentləri sabit qrammatik formaya malikdirlər, yəni birləşmənin hər bir üzvü müəyyən qrammatik formada meydana gəlir. Lakin hər bir dilin daxili qayda qanunlarından, xarakteirndən asılıdır. Frazeoloji birləşmələrin əsas xüsusiyyətlərindən biri də birləşməni təşkil edən sözlərin ardıcıllığıdır. Yəni biz "həyatıyla oynamaq" birləşməsində sözlərin yerini istədiyimiz kimi dəyişə bilmərik. Bununla nəinki məna itəcək, ümumiyyətlə frazeoloji birləşmə adi mənasız söz ardıcıllığından başqa bir şey olmayacaq.

Feli birləşmələr bütün mürəkkəb quruluş və xüsusiyyətlərinə baxmayaraq hər bir dilin ayrılmaz və eyni zamanda əvəzolunmaz hissəsini təşkil edir. Məhz söz birləşmələri dilin zənginləşməsində və ədəbi cəhətdən mənalı olmasında mühüm rol oynayır.

Bir çox dillərdə ekvivalent məna daşıyan söz birləşmələri olduğu kimi, məhz müəyyən dilə məxsus frazeoloji birləşmələr də vardır ki, onlar digər dilə tərcümə edib, düzgün ifadə etmək üçün izahlı lüğətlərdən istifadə mühüm əhəmiyyət kəsb edir. Məs:

Untar la mano (h.t. əlini yağlamaq)- tərcüməsi isə rüşvət vermək-dir.

Tərcümə zamanı qarşılaşdığımız frazeolji birləşmələr bəzən böyük çətinliklər törətsə də praktiki və nəzəri cəhətdən böyük əhəmiyyətə malikdirlər. Belə ki onlar müxtəlif dillərdə eyni real mənaya malik sözlərlə ifadə olunan çoxsaylı üslubi funksiyaları yerinə yetirirlər. Hər bir dildə bu birləşmələrin məna ahəngi də müxtəlif olur. Belə ki, ayrı-ayrılıqda tamamilə başqa mənalara malik olan sözlər frazeolji birləşmələr daxilində öz ilkin mənalarından uzaq bir məvhumu ifadə edə bilirlər. Bu zaman tək bir söz deyil, bütöv bir frazeoloji birləşmə tam məna kəsb edir. Bir çox frazeolji birləşmələr müxtəlif dillərdə müxətlif cür ifadə olunsa da eyni məna daşıyır, yəni ekvivalent olurlar.

tener manos de oro – qızıl ələ malik olmaq (Tiene unas manos de oro para bordar. A. Palacio Valdys: "La hermana San Sulpicio")

Frazeoloji birləşmələrin tərcüməsi zamanı bəzi çətinliklər yaranır. Belə çətinlikləri ardan qaldırma üçün ilk növbədə frazeoloji birləşmələri mətnin daxilində ayırd eləmək lazımdı. Daha sonra isə azərbaycan dilinə düzgün tərcümə üçün müxtəlif üsullardan istifadə edilir.

Ekvivalent tərcümə- tərcümə edilən dildə həmin frazeoloji birləşmələrə uyğun söz birləşmələri olduqda istifadə olunur.Məs.:

meter las narices en una cosa – burnunu harasa soxmaq, başqasının işinə burnunu soxmaq, bir işlə çox maraqlanmaq ( Hacna tiempo que querna meter las narices en el piso. Habna ondo contar cosas tan extrasas. J.Goytisolo : "El circo")

Təsviri tərcümə- bu üsuldan istifadə edən zaman frazeoloji birləşmələrin mənasına uyğun sərbəst tərcümə aparılır.Məs:

Con la cola entre las piernas (patas) (h.t.-ayaqları(pəncələri)arasında quyruq ilə - qorxa-qorxa, dişləri bir-birinə dəyə-dəyə (Regresy con la cola entre las patas... G.Lupez y Fuentes: "Mn general")

Qarışıq tərcümə- belə frazeoloji birləşmələri tərcümə edərkən onun izahını vermək bəzən mütləq sayılır.Məs:

Salir a usa de caballo (h.t.-atın dırnağına çıxmaq) – toz olmaq, güllə kimi götürülmək, aradan çıxmaq, daban 56 qaçmaq (...su jefe tuvo que salir a usa de ceballo de un pueblo de Andalucna pocos dnas antes, perseguido por sus propios secuaces. P.Escalante: "La vida por la muerte")

Antonim tərcümə - çox vaxt təsdiq formasında olan frazeoloji birləşmələri inkar formasında ifadə etməklə tərcümə etmək daha uyğun olur. Məs:

No tener manos limpias-(h.t. təmiz əli olmamaq)- əli əyri olmaq

Yuxarıda göstərilənlərdən məlum olur ki, ispan və azərbaycan dillərio müxtəlif dil qruplarına daxil olmaqlarına baxmayaraq hər iki dildə ekvivalent olan frazeoloji birləşmələr var. Ekvivalenti olmayan ispan dili frazeloji birləşmələri isə azərbaycan dilinə müxtəlif yollarla-yaxın mənalı frazeoloji birləşmələr və ya izahı verilməklə tərcümə oluna bilər.

**Ədəbiyyat:**


1. H.Ə.Həsənov "Müasir Azərbaycan dilinin leksikası" Bakı-1988
2. Ə.Ə.Orucov "Azərbaycanca-rusca frazeologiya lüğəti" Bakı 1976
3. Алберто Буитраэо ¨Дижжионарио де дижщос й фрасес щежщас" Мадрид 2008
4. Эордана Враниж ¨Щаблар пор лос жодос¨ Мадрид 2004
5. "Дижжионарио русо –еспañол ¨ Рубиñос 1985
6. В. Б. Григорьев « История испанского языка» Москва 1985
7. Б.М.Нарумова ¨Дижжионарио Еспañол-русо¨ Москва 1988

## СПОСОБЫ ПЕРЕВОДА ФРАЗАЛАГИЧЕСКИХ ЕДИНИЦ ИСПАНСКОГО ЯЗЫКА НА АЗЕРБАЙДЪАНСКИЙ ЯЗЫК

В статье рассматривается способы перевода фразеологических единиц на азербайдъанский язык и даны образцы для каъдой формы перевода.

## METHODS OF TRANSLATİON OF THE PHRASELOGİCAL UNİTS OF SPANİSH TO THE AZERBAİJANİ LANGUAGE

The article deals with the methods of translation of the phrase logical units of Spanish to the Azerbaijani language and some examples are given for each form of translation.

# *İSPAN DİLLİ ÖLƏKƏLƏRİN MÜRACİƏT FORMASINDA ŞƏXS ƏVƏZLİKLƏRİNİN İŞLƏNMƏSİ*

**Rəhimə MƏMMƏDOVA,** *ADU-nun "İspan dili kafedrasının" b/ müəllim*

Latın Amerikası ölkələrində ispan dilinin statusuna bir çox xarici linqvistlər müxtəlif nöqteyi nəzərdən yanaşırlar. Hər bir Latın America ölkələsinin mətnlərində dilin özünə məxsus dəyişiklərini tədqiq etsək onda görərik ki, ispan və amerika-ispan variantı arasında fikir ayrılığına baxmayaraq, kasteyano dilinin əsas strukturu olduğu kimi qorunub saxlanılmışdır. Sadəcə olaraq hər bir ispan dilli ölkə öz tarixini, mədəniyyətini, ziyalılığını və incəsənətini tərənüm edən milli dil variantları ilə bir-birindən fərqlənir. Belə məlum olunur ki, hər bir Latın Amerika ölkəsinin milli variantı kasteyanonun əsas quruluşunu təmamilə qoruyub saxlayaraq, onun daxili qanunları çərcivəsində dəyişikliklərə uğrayır. Bu dəyisikliklər də həmin xalqın tarixi, mədəniyyəti, incəsənəti və elmi inkişafı ilə yanaşı social faktorla da sıx əlaqdardır. Social faktorlara aid bir misal çəkə bilərik, buda Ekvadorda kənd əhalisinin hörmət mənasında tez-tez mütaciət etdiyi *"su mercyd"* social təbəqələr arasında fərqi aciq-aydın göstərir. Təəssüflər olsun ki, təqribən XX əsrin sonlarına qədər bu ölkədə dırnaq arası desək "feodalizm münasibətlər anlayişı hələ də mövcud olması *"su merced"* və ya *"su mercy"* hörmət və izzət mənasını qoruyub saxlamaqdadır. Halbu ki, *"su merced/ əlahəzrət"* digər ispan dilli ölkələrdə (Mexiko, Çili, Arxentina) və Priney yarımadasında müasir dövrdə köhnəlmiş söz kimi, başqa sözlə desək, arxeizm hesab edilir.

Gündən günə sosial faktorun dilə təsirinin artması ilə ispan dilli ölkələrinin təbəqələri arsında müraciət formalarında çox işlək olan səxs əvəzliklərinin müxtəlifliyi nəzərə çarpacaq dərəcədədir və bu bir sıra dilçilərin tədqiqat obyektinə səbəb olmuşdur.

Priney yarımadaşından fərqli olaraq, Latın Amerikası ölkələrinin danışıq nitqində şəxs əvəzliklərinin müxtəlif olaraq işlənməsi müraciət formalarında daha geniş yer tutur. Belə ki, müasir dövrdə Ispaniyada tək halda "*tc* – sən, "*usted* –siz (nəzakət forması), və cəmdə isə "*vosotros/as-* siz, "*ustedes*-siz/lər (nəzakət forması) səxs əvəzlikləri işləndiyi təqdirdə, digər ispan dilli ölkələrdə "*tc, vos-usted, su merced* müraciət formasının əsasını təşkil edir.

Rayon və kəndlərdən əhalinin kütləvi şəkildə şəhərə axını ilə əlaqədar olaraq, "*vos* forması mərkəzlə yanaşı, Sierrada da müraciət edərkən daha çox işləkdir. Voseo adlanan bu forma nəinki əhalinin orta təbəqəsi eyni zamanda ali təbəqəyə aid olan mədəni insanların məişət və saya danışıq dillərində geniş vüsət tapmışdır.

Yalnız müraciət formasında *"su merced"* sözü kənd əhalisinin özlərindən fərqləndirdikləri ali səviyyəli sədə şəxslərə, xüsusəndə fermanın sahiblərinə,

"ağalarına və onların övladlarına müraciət edənkən islənilir. Bəzən *"su merced"* sözü fonetik dəyişikliklərə uğrayaraq, *"d* samiti düşür , *"y-* saiti isə vurğu daşıyaraq və *"su mercy"* formasını alır. Bildiyimiz kimi *"d"* sözün sonunda cox zəif səslənir, başqa sözlə desək, bu zaman dil bu səsin tələffüz vəziyyətini almasına baxmayaraq səslənmir. Danışıq nitqində *"su merced"* sözü *"su mercy"* variantına keçir.

-*Usty* perdone, sesu ingeniero, pero tengo que decirle una cosa.

- Dn lo que gustes, negro

- Verb *su mercy*. Estando yo ...... (A Ortiz)

Ispaniyadan fərqli olaraq, XX əsrin ortalarindan Ekvadorda ailə daxili anarxiyanın vüsət almasına baxmayaraq, *"Usted"/siz* forması ali təbəqəyə məxsus ailələrdə valideyinlərin uşaqlarına və ya əksinə, övladların ata və analarına etdikləri müraciət formasında işlənən şəxs əvəzlikləri əsasını təşkil edirdi. Yüksək təbəqəyə aid olan ailələrdə hörmət və nəzakət anlayışını əks etdirən *"Usted"* müasir dövrdə öz əsas mənasını qoruyub saxlamaqdadır. Belə ki, *"Usted"* –dən fərqli olaraq "*tc* –nun yerinə "*vos* işlənməsi daha çox əraziyə yayilmışdır.

Aşağı təbəqəli ailələrdə isə *"tc; vos; usted*-in mənaca işlənmə xüsusiyyətləri bir-birindən fərqlidir. "*Vos*-un mənaca işlənməsini arasdırsaq, qeyd edə bilərik ki, "*vos* formasında təsriflənən fel "*tc* –nun xəbər şəkilçisini qəbul edir. Aşağıdakı dialoqun bir parçasına diqqət yetirsək onda belə məlum olunur ki, "*saber* feli Presente de Indicativo formasının II şəxsin təkində təsriflənən şəkilçisini qəbul etmişdir. Eyni zamanda "*usted/* siz öz ilkin və əsas mənası olan hörmət və ya nəzakət bildirmir. O, bu mənalardan təmamilə uzaqlaşaraq, formal bir xarakter daşıyır və bu zamanda "*tc, vos*-la eyni məna kəsb edir.

- Oye, Manuel ¿ *sabes vos?*
- ¿Quy, ah..?
- ¡ *Tc sabes* y lo saben todos!
- ¡Oiga, joven Manuel!
- ¿Ah?
- *Usted* creyu que soy loco. Pero no es asn...
- Ve, Manuel, *a vos* te lo voy a contar.(E. Gil)

Situasiyalardan fərqli olaraq "*usted/* siz öz leksik mənasını mətnin kontextual mənası ilə əks mütənasiblik təşkil edə bilər. Bu zaman öz leksik, yəni hörmət və nəzakət bildirən mənasını təmamilə uzaqlasaraq, vulgaq sözlə də işlənərək, həmin dilin üslubi xüsusiyyətlərini özündə əks etdirir. Aşağıdakı misaldan da belə qənaətə gələ bilərik ki, *"tc; usted"* bir çox Latın Amerikası ölkələrində mətnin mənasına və situasiyadan asılı olaraq müxtəlif mənada müraciəti özündə təzahür etdirir.

Uşaqlara nəzakət göstərərkən, əzizlərkən Meksikada həm yüksək, həm də aşağı təbəqəli ailələrdə "*tc* /sən ilə müraciət daha üstünlük təşkil edir. ¿Comu estbs, mi querida? Pasate. Ekvadorda isə əksinə daha çox *"usted"/siz* şəxs əvəzliyi ilə müraciət edilir. Siyntese aqun, mi amorcito. Pasame la cucharra, mi corozoncito. (3, səh. 76)

Ekvadorda "*usted* / siz komunikativ situasiyadan asılı olraq dəyişir. O, uşaqları əzizləmək mənası ilə yanaşı, onlara əmr verərkən və ya qışqıraraq müraciət edərkən də işlənir.

Bütün qeyd etdiklərimizi bir daha nəzərdən keçirsək belə qənaətə gəlirik ki, ispan dilli ölkələrdə müraciət formasında şəxs əvəzliklərinin işlənməsinin müxtəlifliyi həmin ərazinin mədəniyyəti, elmi –mədəni inkişafı ilə yanaşı sosial faktorlardan, komunikativ situasiyalardan və mətnin kontekstual mənasından asılıdır.

**Ədəbiyyat**


1. В. Виноградов, Грамматика испанского языка , Москва, стр. 12-28
2. Степанов Г. В. К проблеме языкового варьирования: Испанский язык Испании и Латинской Америки, М-1979
3. Фирсова Н. М. Испанский речевой этикет , М- 1991
4. Фирсова Н. М. Обращение в современном испанском языке, М- 1987
5. Рамóн Сармиенто Эонзáлез, Эрамáтиъа проэресива де еспаñол пара ехтранжерос, Мадрид-2003
6. Еэуилуз Л. Формулас де тратамиенто ен ел еспаñол, Мадрид-1981



РЕЗЮМЕ

**УПОТРЕБЛЕНИЙ ЛИЧНЫХ МЕСТОИМЕНИЙ В ФОРМЕ ОБРАЩЕНИЙ В ИСПАНОЯЗЫЧНЫХ СТРАНАХ**

Различия употреблений личных местоимений в форме обращений в испаноязычных странах не только зависит от культуры, научного развития данных мест, также от социальных факторов, коммуникативных ситуаций и контекстуального значения текста.



SUMMARY

**USE OF THE PERSONAL PRONOUNS İN THE FORMS OF ADDRESS İN THE SPANİSH SPEAKİNG COUNTRİES**

The variety of the use of the personal pronouns in the forms of address in the Spanish speaking countries depends not only on the culture and scientifically cultural development, but also on the social factors, communicative situations and contextual sense of the context.

# AZƏRBAYCAN DİLİ LEKSİKASININ KLASSİKLƏRİN, ƏDƏBİ-BƏDİİ ƏSƏRLƏRDƏ VƏ DİALEKTDƏ İŞLƏNMƏSİNƏ DAİR

**Göyçək BAYRAMOVA**, *AMEA-nını dissertantı.*
**Rəyçi: Tofiq HACIYEV**, *AMEA-nın müxbir üzvü, Türk Dil Qurumunun həqiqi üzvü, Filologiya elmlər doktoru, professor.*

Azərbaycanda inkişaf etmiş elmlərdən biri də dilçilik elmidir. Azərbaycan dilçiliyinin müxtəlif sahələri vardır. Bu sahələrdən biri olan dialektologiya hər hansı bir dilin dialektlərinin, ləhcə və şivələrinin öyrənilməsi ilə məşğul olur. Azərbaycan dilinin digər türk dilləri ilə müqavilləsinin əsasını məhz Azərbaycan dialektləri təşkil edir. Azərbaycan dilinin dialekt və şivələrində dialekti vardır.

A.Meye yazır: "Dialektlərin mövcud olmasının da böyük əhəmiyyəti vardır: onların mövcud olması nəticələri həmişə bir cür olmur, lakin dialektlərin yarandığı şəraitdən asılıdır". Alim dialektlərin çox yığcam və mənalı izahını vermişdir. "Dialekt, hər şeydən əvvəl, vəhdətdə olan müxtəliflikIə, müxtəliflikdə olan vəhdətlə səciyyələnir."

Azərbaycan dilinin dialekt və şivələrinə aid toplanmış materialları, onlara aid yazılmış əsərləri nəzərdən keçirdikdə məlum olur ki, hələ də klassik ədəbiyyatda və dialektlərimizdə təsdiq olunası materiallar var.

Aparılan müşahidələr, tədqiqatlar göstərir ki, dilimizin tarixi, onun qədim dövürlərlə bağlılığı dialektlərimizdə indi də mühafizə olunub saxlanılır.Dilin ictimai ünsiyyətində, müəyyən məqamlarda, xalq ədəbiyyatında, adi danışıqda onlardan yenə də istifadə olunur.

Azərbaycan xalq dilinin formalaşmasında iştirak etmiş qəbilə və tayfaların dil elementlərinin heç də hamısı ümumxalq dili səviyyəsinə yüksələ bilmədi.Azərbaycan dilının leksik və morfoloji qurluşunda da ayrı-ayrı qrammatik əlamətlərin dialekt mənsubiyyəti getdikcə daha artıq nəzərə çarpdı.Azərbaycan dili dialekt və şivələrinin leksik xüsusiyyətlərinin seçilməsi bu istiqamətdə gedirdi.

İqtisadi həyat birliyinin zəifliyi, müxtəlif inzibatı bölgülər ayrı-ayrı dil vahidlərinin məhdud ərazilərdə işlənməsi üçün şərait yatmışdır. Əbədi dil normalarının sabitləşməsi isə müxtəlif qramatik əlamətlərin dialekt təbiətini daha aydın göstərir.

Qərb dialektində xüsusilə Gədəbəy şivələrinin lüğət tərkibindəki qeyri terminoloji leksik vahidlər sırasında diqqəti cəlb edən cəhət, ümumxalq dilində olan tarixən qədim dövrə aid sözlərin əksəri bu şivələrin qədim fonotik qaydalarının əsasında saxlanaraq, əbədi dildən və bir çox başqa şivə

qruplarından fərqlidir. Bu sözlər tarixi nəticələrə gətrib çıxaran faktlar kimi nəzər diqqəti cəlb etməyə bilmir.

İşlənmə ilə əlaqədar olaraq sözün mənasında tədrici yeniləşmələr tarixən şivələrin lüğət tərkibində forma və məna zəngiliyinin yaranmasına səbəb olmuşdur.Buna görə də məna genişliyi, məhdudluğu, işlənmə mövqeyinə görə əhatəli olub-olmamasından aslı olaraq, lüğət tərkibində olan maraqlı faktları müşahidə etmək olar. Şınıx şivəsində xüsusən dağ dibi kəndlərinin danşığında müasir əbədi dil və digər şivə qruplarında rast gəlmədiyimiz leksik formalara təsadüf edirik.

Şivə lekskası bu və digər xalqın tarixini, adət-ənənələrini, məişət tərzini, ayrı-ayrı prosesləri bildirən sözləri və sair əks etdirir. Bu cəhətdən şivələr daha zəngin materiala malikdir. Çünki şivələrdə tarixi dövürlərin izləri, arxaik sözlər ədəbi dilə nisbətən uzun zaman qorunub saxlanılır.

Gədəbəy şivəsinin özünəməxsus zəngin və rəngarəng lüğət tərkibi vardır. Bu şivənin lüğət tərkibində ədəbi dilimizin qədim dövürlərinə aid yazılı abidələrdə işlədilən sözlər bu günə qədər saxlanmaqdadır. Belə sözlərdən “ismarlamax” (xəbər göndərmək) sözü “Kitabi-Dədə Qorqud”un dilində və müasir Türkiyə türkcəsində işlənməkdədir.

Bu şivədə belə sözlər daha çoxdur.Belə sözlərə klassiklərin əsərlərində təsadüf edilir.”Umınax”, “kəmtər” sözünə “Kitabi–Dədə Qorqud”dastanlarında və Şah İsmayıl Xətainin əsərlərində çox tez-tez təsadüf edirik .

Məsələn:

I. Məşhər günündə lütfün umar dəstigir ola,
Miskin Xətai xəstəyə,kim pirgünahdır.

II. Xətai, eşqində kəmtərindir,
Umar səndən ətalər dürlü-dürlü.

III. Ah, noleydi, bu oleydi, birinə vareydim.
Umarımdan yaxşı-uyar oleydi. Və s.

Belə misalların sayını çoxaltmaq olar. Çünki “Kitabi-Dədə Qorqud”un dilində işlənən bir sıra sözlər şivələrimizdə qorunub saxlanmışdır.

İrak // irağ-uzaq

“İrağ” sözü Şınıx şivəsində işlədilən maraqlı sözlərdən biridir. Bu sözə “Kitabi-Dədə Qorqud” dastanlarında, sonralar isə klassiklərin əsərlərində, Ş.Xətainin və İ.Nəsiminin əsərlərində rast gəlmək olar:

I.İrağından-yaxından gəlmişdilər.

II. İrağdan göstərdilər.

III. Bu Xətai düşəli söhbəti-vəslindən iraq
Bağrı büryan kimiyü gözləri giryan kimidir.
Gözündən çün iraq oldu Xətai,
Qəti bimarü rəncur oldu könlüm.
Səndən iraq, ey sənəm, şamü səhər yanaram,
Vəsəlini arzularam, daxi betər yanaram.

Məndən iraq olduğun bağrımı qan eylədi,
Gör necə tabından, ey şəmsü qəmər, yanaram.

Gədəbəy dialekti şınıx şivəsində:
Allah bizi xatadan iraq eləsin.
İsmarlamaq – xəbər göndərmək
Oğlanı ismarlayıb Dirsə Xandan saqladılar. Dədə Qorqud birini bindi, birin yetdi. Yaranlar, sizi həqqə ismarladım-dedi, getdi.Derəm, qanın alalım; həm sizə ismarlamış.
"Kitabi-Dədə Qorqud" da işlənən "Çənbər" sözü oğuzların geyim kompleksində tam bəlli olmayan libas növü olduğu təsbit olunmuşdur. Dastanın məzmunundan məlum olur ki,bu qadın geyminə mənsub müəyyən formalı baş örtüyü, çarşab olmuşdur.
Burada Xatun Qazana müraciətində söyləyir!
Qara dırnaq ağ yüzümə çalayınmı?
Yüz alması kibi al yanaqların yırtayınmı?
Çənbərümən alca qanım dökəyimmi?
Azərbaycan dilinin Gədəbəy rayon şivələrində bu gün də nehrənin baş tərəfinə vurulan dairəvi başlığa "Çənbər" deyilir. Məs; Nehrənin çənbəri qırılıf, qatığı axıder.
Busarıq- duman, çən
"Dədə Qorqud" dastanından məs;.....Düm qara busarıq ordumun üzərinə tökülür gördüm....
Maraqlıdır ki, "busarıq" sözü hazırda Gədəbəy şivəsisində "basırıq" – səliqəsiz mənasında işlənməkdədir. Məs; Həyat-baja basırıxdı.
Qaraçaşmaq // qurcuşmaq- bir-birinə qarışmaq.
Məs; Qurcuşuban – uğraşuban tağdan endi.
Bu qədim lüğət vahidi eyni mənada "İxtiyaratiqəvaidi külliyəyə" də də müşahidə edilir.Məs; - Əgər göz kənarı məşriğ tərəfdən qızarsa, iqlimlər qarcaşa; Cümlə aləm qarcaşa.
"Qarcaşmaq" sözü bu gün Gədəbəy dialektində "qaracaşmax" şəkilində işlənərəek "qaralıb-çaxnaşmaq" mənaları daşıyır. Məs: Hava yaman qarcaşer, deyən yağajax.
Yalab-yalab // parıl - parıl işıq saçan, parladmaq.
Məs. Yalab - yalab yalabıyan incə donlum.
"Yalab-yalab" Gədəbəy şivəsində "alaf-alaf" şəkilində işlənməkdədir. Məs: Bir don geynif alaf-alaf yaner.
İley-qabaq, ön tərəf Məs: İləində düğün var, Düğünə varıb ötgil! – dedi.
"İley" sözü Mustafa Zəririn əsərində də öz əksini tapmışdır. Məs: "Gördüm kım, bir cəmaət xeyməsinnün, ileyində durarlar"
Bu söz indi də Azərbaycan dilinin Gədəbəy dialektində ön tərəf, qabaq və s. mənalarında işləməkdədir.Məs: O, həyacanan özünü elə itirmişdi ki, ileyinən gələnnəri görmördü.

"Kitabi - Dədə Qorqud" da işlənən maraqlı sözlərdən biri də "yaşmaqlanmaq" sözüdür. Məs; Çağırdılar, Beyrək gəldi, Banuçiçək yaşmaqlandı xəbər sordu.

Bu sözə eyni mənada XIV-XV əsrlər ədəbi materiallarımızın dilində də rast gəlmək olar."Sıtqım sıyrılıf"-söz birləşməsi şəklindədir.Azərbaycan dialektolagiyasında bu söz çoxdan məlummdur. Əhali arasında onun aldığı məna çalarlarından, semantikasında lazımınca bəhs edilməmişdir. Bu söz-zəhləsi getmək, incimək mənalarında Gəəbəbəy dialektində bu gündə işlənməkdədir. Məsələn: Sıtqım sıyrılıf daha olara getmerəm.

Belə bir faktın Ərzurumlu Mustafa Zəririn və Qazi Bürhanəddin kimi XIII-XIV əsr klassiklərimizin dilində varlığı çox şey deyir. Görünür, bu xüsusiyyət lap qədimlərdən Azərbaycan danşıq dilində mövcud olmuşdur.

Qancaru // qancərü // hancarı. Keyfiyyət, əlamət, tərz və s. məna çalarlıqları ifadə edən bu əvəzlik "Əsrarnamə" də daha çox təkan anlayışı bildirir. Məs:

Dedü əzmün qancərudur, ey əziz,
Dedi ol məşuq əzmün qancəru,
Qancəru xər gedər isə çağurur.

Maraqlıdır ki, bu əvəzlik müxtəlif fonetik variantlarda Gədəbəy dialekt və şivələrində indi də işlənməkdədir. Hancarı // nə təhər? Necə?

Məs: Hancarı xavarım olmayıf.

Tədqiqat obyekti kimi götürülən "Əsrarnamə" də daha çox "q" variantı müşahidə edilir. Çünki "Əsrarnamə" XV əsrin yadigarıdır. Dialektlərimizdə isə "q"- "h" səsi ilə əvəzlənmişdir.

"Çalpoy" Osmanlı- türk ədəbiyyatı ilə müqayisədə ədəbi materiallarımızın dili üçün bir o qəüdər səciyyəvi olmamışdır. H.Mirzəzadə bu münasibətlə yazır:„ ehtimal ki, bu qərb türkcəsinin təsiri nəticəsində bu və ya digər yazıçının dilində özünə yer tapmışdır. Vaxtilə müəllifin irəli sürdüyü bu fiziki XVI əsrin ən böyük nəsr nümunələriində "çalpoy" sözünə rast gəlirik.Unutmaq olmaz ki, "Şühədanamə" ədəbi dilindən daha çox ümumixalq danışıq dilinə arxalanan bir əsərdir. Bu sözə "şühədanamə" mnin dilində rast gəlirik. Bu qədim söz heç də təsadüfi deyildir ki, bu gün dialekt və şivələrimizdə müşahidə edilir. Azərbaycan yazılı abidələrində öz əksini tapmış bu söz dialekt və şivəmizdə geniş yayılmışdır. Məsələn6 Çalpoya düşdüy, gələmmədiy. "Çalpoy" Gədəbəy dialekt və şivələrində "qarlı-yağışlı külək" mənasında işlənmişdir.

"Əsrarnamə" nin dilində miqdar sayları ilə isim arasında işlənən "qətrə" // damcı- sözü, cıqana, az-sözü bu gündə dialekt və şivələrimizdə işlənir. "Əsrarnamə" də

Enmədi gögdən yerə bir qətrə ab.
Gəldi gözindən anun, bir cıqan xun;

Gədəbəy dialekt, şivələrində:

1. Göydən bir qətrə yağış düşmöyf.
2. Bizə bir cıqana duz ver.

Bundan başqa "Əsrarnamə" nin dilində müşahidə edilən sözlərdən biri də "yana" qoşmasıdır. "Yana" qoşması abidənin dilində müxtəlif məna çaları yaratmışdır. "Yana" qoşması Gədəbəy dialekt və şivələrində "ötrü" mənasında işlənir. Məsələn; Sənən yana şəhərə getdim.

"Yana" qoşması ilə bağlı xüsusiyyət digər yazılı abidələrimizdə də müşahidə edilir. Məs: XIV əsrin abidəsi Məsihinin "Vərqa və Gülşa" poemasından.

Dedi; ya Vərqa, gəl bəri bəndən yana,
Bir sözüm var ayidəyim sana,
Çünki gəldüm bu vilayətdən yana,
Qırıq hərami həmlə qıldı bana.

"Əsrarnamə" orta əsrlərdə Azərbaycan dilində yaranmış ədəbi materiallarımız içərisində yüksək dəyəri olan əsərlərdəndir. Çünki bu əsərdə klassik ənənlərlə, ümumxalq danşıq dili xüsusiyyətlərinin vəhdəti vardır. Bu gün əsərdə işlənən sözlərin çoxu dialekt və şivələrmizdə aktualdır və öz köklərini qoruyub saxlasalar da başqa mənalarda işlənməkdədir.

**Qədim türk dilində və müasir**
**Gədəbəy dialektində işlənən sözlər lüğəti.**

**Alaxey** ağıldan kəm. Kərəmin bir, o da alaxeydi (Düz Rəs)

**Alağazdanmax** - yerin üstə çıxmaq. Taxıl təzəcə alağazdanmışdı, dolu vurdu.

**Alatala** - orda, burda bitən, Göyərti yaman alatala pitiy, gərək[1] təzədən səpək[1] (İsalı)

**Andıxmax** - çaşmaq. Az mən gördüm andıxer, bildimkin yalan söylör.(Düz. Rəs.)

**Avazımax** - rəngi solmaq, rəngi qaçmaq. Az elə qorxuf rənqi avazıyıb. (İsalı)

**Ağavəzi** - rəngi solğun. Kərəmin gəlini ağavəzidi, elə bil xəsdəlikdən duruf (şınıx)

**Ağaşdı** - iri boylu, enlikürək.- Bavam yaman ağaşdı kişiydi. (İsalı)

**Alaqqarsax** - bişməmiş. – Alaqarasax elef qava yığıf.

**Alatərisvət** - səliqəsiz, yarımçıq. Öyü alatərisvət süpüruf.

**Alaf-alaf** - par-par parıldamaq. O vaxtlar gəlinin paltarı alaf-alaf yanerdi. (İsalı)

**Alacankeş** - Ölümcül. Heyvanı vuruf alacankeş elef.

**Alım** - sərtcavab verməк. Yaman alımını verdim. (Şınıx)

| | |
|---|---|
| **Axılyana** | - təxmini, qeyri-müəyyən. Məndə axılyana öz yanımnan duruf getdim (Şınıx) |
| **Boylum, boyl** | - axırda, sonra boylum getdk[1] gəlini gətirməyə (İsa) |
| **Beddam** | - rusvay. O dosdarının yanında beddam olmuşdu. Yanında beddam olmuşdu. |
| **Beyqafil** | - xəbərsiz, qəflətən. Qonaxlar beyqafil gəlmişdi. (Düz Rəyullu) |
| **Bambalamax** | - iri tüklərlə yemək. Qavdakı yeməyi bambaleyif qurtarer.(İsles) |
| **Badar baydax** | - yarımçıq qalmış, açıq Öyü tikif başa çatdıra bilmədi (İsalı) |
| **Berbeysan** | - zay, ələ gəlməz. Heyvan kələmi berbeysan elef. (İsalı) |
| **Bıldır- bıldır** | - gilə-gilə, damla-damla Gözünən bıldır-bıldır yaş tökör. (Düz Rəsullu) |
| **Bay** | - dövlətli, varlı, xoşbəxt, Gööm onu bay olmasın (Düz Rəsullu) |
| **Bodur** | - tənbəl. O, qədər bodurdukun gedif çörəx almır. (İsalı) |
| **Cılxa // cımxır** | - xalis, təmiz. ət cılxa piydi. Qoyun cımxır yağlı süd verer. (Düz Rəsullah) |
| **Dini çıxmax** | - Bir növ dəmini almaq. A vatmışdar, bir qon dini çıxsın verem yen. (Düz Rəsullu) |
| **Düpəmək[1]** | - Hamısını yemək. Çörəyin hamısını düpədi. (İsalı) |
| **Döşürmək[1]** | - yığmaq, dənləmək, çiçək döşürməyə dağa çıxerix. |
| **Dələmurt yeri** | - gəlir yeri. Olar bir dələmurt yeri axtarerlar. (İsalı) |
| **Dınnayıx** | - bir az, lar az.Mana dınnayıx un ver, (İsalı) |
| **Dənli** | - qədər sizə verdiyim dənli un qalıf. (İsalı) |
| **Əmbiz-əmbiz** | - salxım-salxım. Meşədə söyüddər əmbiz-əmbiz olmuşdu. (İsalı) |
| **Əmbə** | - ancaq. Əmbə bizə gəlmədi. (Düz Rəsullu) |
| **Fasıx** | - yerə baxan adam, hiyləqər Noyruzdan fasıx adam yoxdu. (İsalı) |
| **Fəsihmək[1]** | - pis olmaq, təsir etmək. Onun xəstələnməyinə fəsihdim. (İsalı) |
| **Fırıx** | - işi əngəl olan. Gördü işi fırıxdı, aradan çıxdı. (İsalı) |
| **Gouldamaq** | - bərkdən danışmaq. Danışanda gor gor gorular başa düşmək olmor. (Düz Rəsullu) |
| **Gavdan** | - qoca. Dədəm yaman gavdan ef. (İsalı) |

Görüklü - gözəl, qəşəng.
Halal hivəsi - halal xoşu. Halal hivəsi olsun o qədər yaxşılıx eləmişəm. (Düz Rəsullu)
Höysər - Ağacdan düzəldilmiş nimçəvari qab. Xəngəli çəkerdik höysərə, qurutdor yerdix:
Högat - istilik. Ojağın högatı yoxdu. (İsalı)
Xırsdanmax - hirsdən ağlamaq. O,qədər mana təsir elefkin xırsdanmışam. (Düz Rəsullu)
Xuruşdanmax - işsiz otura bilməmək. Bir xuruşdandım paltar yüyüm, yağış yağdı. (İsalı)
Xorlamax - isdəməmək. Bir dəfə də olsun xorlamey.
İsmarramax // ismarış - sifariş, xəbər göndərmək. İsmmaramışam savax gələr. (Düz Rəsullu)
Kəmtərr - eybəcər, qısa. Burnu yaman kəmtərdi. (İsalı)
Kəllədar - lovğa. Yaman kəllədarrıx elersen (İsalı)
Kəltə - dünyagörmüş, çox bilmiş. Bizim kətdə kəltə adam çoxdu (Düz Rəsullu)
Korafəhim - fərasətsiz, ağılsız. Söyünün uşaxlarının hamsı korafəhimdir. (Düz Rəsullu)
Korun-korun - yavaş-yavaş, öləziyərək yanmaq. Mən neylem, ojax korun-korun yaner. ( Düz Rəsullu)
Qaroy - kor. Gözdəri çoxdan qaroy oluf. (Düz Rəsullu0
Leqi - tənbəl, avara. Əlinən iş gəlmer ha, peydər kəndin arasında leqiləner.
Lodur - tənbəl, söyünün oğlu lodurdu. (Düz Rəsullu)
Nuar - cecim haşiyəsi. Tavatın kilimindəki nuarar xoşuma gəldi. (İsalı)
Özgəhan vaxt - başqa vaxt. Özgəhan vaxt ger işim var (İsalı)
Pərçimlənmax - oturduğu yerdən qalxmamaq. Niyə pərçimlənifsən gəl çıx. (İsalı)
Puçanax - barmaqların arasında xəstəliyi. Barmaxlarını yaman puçanaxlef. (Düz Rəsullu)
Pərsoy - pinti, səliqəsiz. Bir dəfə görmədik[1] adam kimi geyinsin, elə peydər pərsoy kimi geyiner. (Düz Rəsullu)
Sazax - külək, sazağın qavağında oturma qançır olarsan. (Düz Rəsullu)
Səyvənt - ağıldan kəm, dəli. Əhməd tətmiz səyvəntdi. (İsalı)
Suç - günah. Onun suçu vareymiş. (İsalı)
Şırmanmax - yaltaqlanmaq. İşi düşən adama şırmaner. (İsalı)
Şilquduz - pis xasiyyət, nadinc, Tahir şilquduzdu, ham ıya sataşer. (Düz Rəsullu)
Şüleylim - saç yolmaq, savaşmaq. Qonşular şüleylim

çəkdilər. (Düz Rəsullu)

**Ulamə salmaq** - itirmək, gizləmək. Haraveyyi ulamə saldılar, tapammerrıx. (Düz Rəsullu)

**Ədəbiyyat:**


1. "Kitabi-Dədə Qorqud" Bakı Öndər nəşriyyatı 2004
2. Şah İsmayıl Xətai əsərləri 1 cild Bakı 1975.
3. M.Şirəliyev Azərbaycan dialektologiyasının əsasları Bakı 1968.
4. F.Zeynalov Türk dillərininin müqayisəli qrammatikası.1 hissə
5. A.Axundov Ümumi dilçilik.Bakı 2006.
6. Ş.Xəlilov "Əsərnamə" nin dili Bakı 1988
7. T.Hacıyev "Dədə Qorqud Kitabı" ensiklopedik lüğət, Bakı 2004
8. İ.Nəsimi əsərləri I cild Bakı 2004
9. Mustafa Zərir klassik ədəbiyyatdan seçmələr, Bakı 2000
10. Məsihi; "Vərqa və Gülşa" Bakı 2004



## Р Е З Ю М Е

Есть ценные факты для исследования исторического развития Азербайдъанского языка, диалектогии, которое является основной проблемой современного языкознания.

И сегодня отмечаются факты использования современных диалектов в языке литературно-худоъественных памятников и в проведениях классиков.

В конце прилагается словарь диалектных слов, используемых ъителями Кедавекского района.



## RESUME

There are valuable feasts for the investigation of the historical development of the Azerbaijani an language and of dialectology as one of the major problems of Modern linguistics.

The facts proving the usage of voids used in the literary monuments and in the works of classical waters in the dialects are also shown. at the end a glossary of woods used in the Jadabay dialectic supplemented.

*Ədəbiyyatşünaslıq*

# KALDERON VƏ ONUN YARADICILIĞI

*Jalə QƏNBƏRLİ, Azərbaycan Dillər Universiteti*

Böyük ispan dramaturqu Don Pedro Kalderon de la Barka 17 yanvar 1600-cü ildə Madriddə kral xəzinəsinin katibi Dieqo Kalderonun evində dünyaya göz açmışdır. Təmtəraqlı adı (Pedro Kalderon de la Barka Enao de la Barreda i Pianyo) və «İnam naminə» şüarlı gözqamaşdırıcı gerbi uzun illər bir çox tədqiqatçıları onun aristokrat mənşəli olmasını düşünməyə vadar etmişdir. Əslində orta səviyyəli bir dvoryan ailəsinə mənsub olan Kalderon ilkin təhsilini Madridin yezuitlər kolleci olan «Kolexio imperialinda» almışdır. Daha sonra isə erkən itirdiyi anasının onu ruhani görmək arzusunu yerinə yetirmək məqsədi ilə Alkala de Enares, daha sonra isə Salamanka universitetinə daxil olaraq mülki və kanonik hüquqi öyrənmişdir. Salamanka universitetinə daxil olarkən atasını itirən Pedro burada təhsilini fasilələrlə davam etdirir, daha sonra isə ailədə baş verən problemlər onun univuersiteti tərk edərək, Madridə qayıtmağa məcbur edir. Bütövlükdə götürdükdə dramaturqun gənclik illəri barədə məlumatlar qızıl əsrin digər nümayəndələri Servantes və Lope de Veqayla ilə müqayisədə məhduddur. Lakin əldə edilmiş məlumatlara əsasən o, 1619-1623-cü illərdə Madriddə yaşayaraq, azad həyat tərzi sürür və dini karyera barədə belə düşünmürdü. Bu dövrdə o, öz dövrünün dvoryanlarından heç nə ilə fərqlənmir, duellərə çıxır və hətta bir dəfə bir rühaninin bəlağətli nitqini məsxərəyə qoyduğuna görə qısa müddətli həbs edilir.

Məlumatlara əsasən 1623-1625-ci illəri dramaturq Şimali İtaliyada keçirmişdir. 1625-ci ilin sonunda isə yenidən Madridə qayıtmışdır. 1638-ci ildə Fransız qoşunlarının Burdosa daxil olaraq, Fuenterabia qalasını zəbt etməsi vətənpərvər Pedronu qələmi bir kənara qoyaraq, kiçik qardaşı Xoseylə hərbi əməliyyatlarda iştirak etməyə vadar edir. Üç ildən sonra isə Santyaqo orderinə daxil olaraq, Katoloniyada üsyanı yatırmaqda iştirak edir.

40-cı illərdə istər yaradıcılığında, istərsə də, hərbi sahədə uğurları olsa da, Kalderon çox ağır itkilərlə üzləşir. Bir-birinin arxasınca iki qardaşını, daha sonra isə sevgilisi və kiçik yaşlı oğlunu itirən Kalderon çox sarsılır və 1651-ci ildə dinə qapılır. 1653-cü ildə artıq Toledonun «Yeni Krallar» kilsəsinə baş keşiş təyin edilən Kalderon 1663-cü ildə kralın şəxsi keşişi vəzifəsinə təyin edilir. IV Filippin ölümündən sonra isə müqəddəs Pyotr kilsəsinə təyin edilən Kalderon 25 may 1681-ci ildə 81 yaşında dünyasını dəyişir. Həmin gün dramaturqun xatirəsinə İspaniyanın bütün böyük şəhərlərində onun müəllifi olduğu, «auto»lar ifa edilir.

Əgər Lope de Veqa yaradıcılığı intibah dövrünün zirvəsi hesab edilirdisə, Kalderon yaradıcılığı barakko dramaturgiyasının zirvəsi sayılır.

Vəfatına az qalmış dramaturqun şəxsən tərtib etdiyi siyahıya əsasən o, 120 komediya və dramın 80 auto Sakramentalisin, 20 intermediyanın və bir sıra Şer və poemaların müəllifidir. Yazıçı olmaq istəyi hələ kilsədə oxuyarkən baş qaldıran Kalderon artıq 13 yaşında ilk komediyasını yazır. 20 yaşındasa «Müqəddəs İsidora» şərəfinə keçirilən Şer müsabiqəsində mükafat alaraq, Yope de Veqanın xeyir-duasını qazanır. Yaradıcılığının ilk mərhələsi belə başlayan Kalderon bu dövrdə Yope de Veqa yaradıcılığının böyük təsiri altında olsa da, çox texliklə orijinal dramaturq kimi formalaşır. Bu illərə onun «Məhəbbət, şərəf və hakimiyyət (1623), «Məhəbbət oyunu və təsadüf» (1625), «Bredanın mühasirəsi» (1625), «Xain Makkavey» (1623) kimi pyeslər aiddir. 1625-ci ildə İtaliyadan Madridə qayıdan Kalderonun yaradıcılığında II mərhələ başlayır. Bu dövrdə onun əsərləri bütün yaramadada səhnələşdirilir, dramların böyük əksəriyyəti Madridin məşhur «Real Palasiosunda» tamaşaya qoyulur. Dövrünün ən tanınmış musiqiçiləri və səhnə tərtibatçıları artıq saray dramaturquna çevrilən Kalderonun ixtirayına verilir. Bu dövrlərdə dramaturq öz əsərlərində mənəvi-estetik və fəlsəfi problemlərə toxunur, bir əsərdə bir neçə süjet və ideyanı birləşdirir. Bu mərhələ dramaturqun pyeslərinin II cildinin çap edilməsi ilə bitir. Qeyd edim ki, dramaturqun Ən məşhur əsərləri məhz bu dövrə aiddir. «Xaça Sitayiş» (1630), «Məhəbbətlə zarafat etməzlər» (1632), «Ölümdən sonra Məhəbbət» (1635), «Gizli təhqirə gizli intiqam» (1635), «Həyat yuxudur» (1635), «Sehrli cadugər» (1635) və s.

Yaradıcılığının növbəti mərhələsi 30-cu illərin ikinci yarısın və 40-cı illərə təsadüf edir. Bu dövrlərdə yazdığıü əsərlərdə dramaturq daha çox bir fəlsəfi problemi, qəhrəmanın xarakterinin bir xüsusiyyətinidaha qabarıq verərək, onu təhlil etməyə çalışır. Bu dövrün əsərlərinə «Salamey alçaldı» (1641), «Gizlənmiş kavaler» (1636). Avropada «Katolik Faustu» adlandırılan «Sehrli cadugər» (1637). «Daimopis sonluğa inanma» (1648), «Hər şeyin öz vaxtı var» (1650), «Dünyanın böyük teatrı» (1644) kimi əsərlər aiddir.

Həyatının son illərində nəzərə çarpacaq dərəcədə az yazan Kalderon dinə qapandıqdan sonra mifoloji süjetli alleqorik komediyalar və əsas etibarı ilə Auto Sacramentalislər yazır. Dini dram janrı olan Auto Sacramentalis bütün ispan dramaturqları tərəfindən istifadə edilmişdir. Bu yönlü əsərlər dini bayramlar zamanı böyük təmtəraqla şəhərin mərkəzi meydanında eyvanlarda zadəganların, meydanın ətrafında isə geniş xalq kütləsinin seyri ilə nümayiş etdiririldi. Haqlı olaraq, Kalderon auto Sacramentalislərin ən məşhur müəlliflərindən sayılır. Bu yönlü əsərlərdə Kalderon öz pessimist həyat fəlsəfəsini göstərir. «Dünyada əbədi heç nə yoxdur, illər dəqiqələr kimi gəlib ötür. Beşikdən qəbirə isə cəmi bir addımdır. İnsana ancaq buna tabe olmaq qalır»

Bütövlükdə götürəndə Kalderon öz sələfi Yope de Veqa tərəfindən yaradılmış dramatik formulanı mükəmməlləşdirmiş, əsərləri lazımsız elementlərdən təmizləmişdir. Onun demək olar ki, bütün əsərlərinin fərqli cəhəti onların dəqiq və düzgün kompozisiyaya malik olması, fikrin bir və ya iki qəhrəman ətrafında cəmlənməsi, kultizm və konseptizm üsullarından istifadə edərək qeyri-adi ekspesiv dilin mövcud olmasıdır. Bundan başqa Kalderon Yope de Veqadan fərqli olaraq həmişə tamaşanın səhnə və musiqi tərtibatına böyük diqqət yetirmişdir. «Yırtıcı, ildırım və daş» (1652) pyesinin Saray parkında gölün ortasında səhnələşdirilməsi və tamaşaçıların qayıqlarda oturaraq, ona tamaşa etməsi bu fikri bir daha təsdiqləyir.

Kalderon haqqında yazdıqlarımı Hotenin bir fikri ilə tamamlamaq istərdim «Kalderon – Şəkərlə yüngülləşdirilmiş, ədviyyatlarla isə tündləşdirilən yaxşı təmizlənmiş bir içkiyə bənzəyir. Biz onu olduğu kimi – insani ehtiraslandırılan içki kimi ya içməliyik, ya da heç onun dadına da baxmamalıyıq.

**İstifadə edilmiş ədəbiyyat:**

1.Б.А.Кржевский «Статьи о зарубежной литературы», Москва-Ленинград, 1960
2.А.Л.Штейн «Литература- испанской барокко издательство «Наука», Москва 1983.
3.А.Л.Штейн «История испанской литературы» Москва «Высшая школа» 1976.
4. Педро Калдерон де Ла Барка «Драмы», Москва «Наука» 1989.
5.Калдерон «В тихом омуте» «Искусство» издательства Москва 1963.
6.В.И.Плавский Литература Испании IX-XV веков, Москва «Высшая школа» 1986.
7.«Чистилище святого Патрика» драма Колдерона, Москва Издание М. и С.Сабошниковых, 1900.

*Elm adamlarımız*

# ÖMÜR YOLU


Əşrəf MƏMMƏDLİ

Nədənsə onunla bu dəfəki söhbətimizdə söz yoldan düşdü. Günümüzün əsas mövzularından olsa da bunun bizim mətləbə dəxli olduğunu zənn etmirdim. Hər halda ilk baxışdan belə görünürdü.

O, isə uzun illərin o tayında qalmış bir şirin əhvalatı gözləri önündə canlandırıb mənə danışmağa başladı.

...1956-cı ilin may ayının son, yazın da gəl-gəl deyən günlənindən biriydi. Məktəbdən çıxıb al-yaşıla bürünmüş kəndimizin arahq yolları ilə evə tələsirdim. Buna görə də yolumu kəsədən salmağa çalışırdım.

İlin bu allı-güllü vədəsində çiçək-çiçəyi çağırsa da, yalyamaclardan əsib gələn sərin yaz mehi üz-gözümü oxşasa da qəlbimə bir narahatlıq, həyəcan qarışıq qəribə hisslər dolmuşdu. Hələ bərkiməmiş çiyinlərimdən, elə bil, ağır yük sallanırdı. Axı, qabaqdan həm buraxılış, həm də qəbul imtahanları gəlirdi.

Bu yükün altından çıxmaq üçün ürəyimdə Tanrıdan özümə təpər, dözüm diləyir, həm də tövsiyə edirdim ki, ayə, kitabdan-dəftərdən möhkəm yapış.

Beləcə, həyətimizə necə çatdığımdan da xəbərim olmadı. Həyətdən gələn təzə çörək ətri məni fikirlərimdən ayırdı. Çörək ətri burnuma dəyəndə möhkəmcə acdığımı hiss etdim.

Tələm-tələsik həyətə girdim. Anam sacın qırağında, bəmbəyaz süfrənin üstündəki dördayaqda kündələri yayır, hərdən də oxlovla sacdakı xamıralıları o üzbuüzə çevirirdi. İsti dəyən xamıralılar da qıpqırmızı qızarırdı.

Yeyin yeriyib düz anama tərəf getdim.

Rəhmətlik anam təəccüblə üzümə baxıb dedi:

- Ədə, ədə, bala, başaa dönüm, səni qovan vaar, nə qaçhaqaçdı?!

Mənsə cavabımda, - ana,acmışam ee, maa dürmək ver, - dedim.

Anam da, - bismillah! - deyib, qıpqırmızı xamıralını aralayıb arasına motal pendiri qoyub, sonra da bürməliyib mənə uzatdı.

Elə sacın qırağındaca dilimi-dodağımı yandıra-yandıra qaynar dürməyi iştaha ilə yeməyə başladım. Az qalırdım ki, o yekəlikdə dürməyi bir uduma yeyim.

Sən demə, anam maddım-maddım mənə baxırmış. Dürməyin son tikəsini qurtarandan sonra qayıtdı ki, ağrınalım, əlinnən alan yoxdu ha, arxayın ye, dana, dilin, ağzın pülüşükdn çıxdı, axı?!

Bax, eşit, gör saa nə deyirəm. Day, maşallah yekəlib yekə kişi olmusan. Bunnan belə yol seçəndə, yol gedəndə, mənnən saa amanat, tələsmə.

Yol mənzilə çatdırar, yol mətləbə yetirər, yolu da necə tutdun, heylə də gedəssən.

Elə ki, arın-arxayın, amma, inamla yeridin, yolu qəlbin dolusu tutdun, onda mətləbaa da yetəssən, mənzilaa da çatassan, çörəyin də olacaq.

Yox, hərgah tələsidin, o cığırdan, bu cığıra atdandın, budu eey, ocaq közünü görürsən?! Dədələr havayı yerə demiyiblər haa, tələsən təndirə düşər.

Odur ki, qurbanın olum, qəlbin tutduğu yolu seç!

Elə ki, yolun qəlbincən oldu, nə sən yolu yorassan, nə də yol sənnən yorulacaq. Ayaqlarını oxşaya-oxşaya səni mətləbaa aparacaq. Allah, sənin mətləbini versin!

Bax o gün mən də böyük bir yolun başlağıcında durmuşdum. Anam da arxamca su atırdı, nur çiləyirdi, xeyir-dua verirdi.

...Sən demə bayaqkı fikrimdə yanılırammış. Həmsöhbətim bu əhvalatla mətləbimizə yönəlik söhbətlərimizə körpü salırmış.

Mətləbimiz isə onun elm dalınca getdiyi yola sözün qüdrəti ilə işıq salmaq idi.

Hə, indi isə oxucuları intizarda saxlamayıb həmsöhbətimi onlara təqdim edirəm. O, Azərbaycan Elmi Tədqiqat Baytarlıq İnstitutunun Sanitariya, Ekspertiza və Ekologiya laboratoriyasının müdiri, baytarlıq elmləri namizədi, Əşrəf Teymur oğlu Məmmədlidir.

...Uşaqlığım ağır müharibə illərinə təsadüf etdi. Allah iraq eləsin, çox sıxıntılı, məhrumiyyətlərlə dolu illər idi. Birin tapanda, beşin də tapa bilmirdik. Bir qarın ac, bir qarın tox yatardıq.

Ailəmiz ağır idi. Mən beşinci uşaq idim. Sakit, başıaşağı, heç nə də istəməzdim. Görürdüm ki, nənəm, babam, atam, anam gecə-gündüz bilmədən elə hey çalışırlar. Onlar yorğun-arğın evə qayıdanda axşamdan çox ötərdi. Yarıqaranlıqda, lampa işığında hamı süfrə başına toplaşardı. Süfrədə Allahın verdiyindən olardı. Anam xörəyi çəkəndə süfrədə əyləşənlərin sayını hərdən itirərdi. Bir nəfərimizə pay çatmazdı. Allahdanıydı, bəndədən idi, bilmirəm, o da həmişə mən olardım. Mən də qəti səsimi çıxarmazdım. Bilirdim ki, day, qazan boşdu. Səs salsam da qazan dolası ha deyildi!? Odur ki, heç kəsə bildirməzdim. Yorğanın altına girəndə isə doyunca səssi-səssiz ağlayardım. Səhər işdən hali olan anam elə vəziyyətə düşərdi ki! Bütün günü özünü yamanlayardı.

Müharibəni də, dava salanı da lənətləyir, anamın halına isə acıyardım. Uşaq ağlımla öz-özümə təskinlik də verərdim. Neynək, qoy, böyüyüm, gedib həkim olacam, buzovlarımızı, quzularımızı sağaldacam, evə qazanc gətirəcəm, qazanlarımızı dolu-dolu qaynatdıracam, xamıralı çörəyimiz çox olacaq təhnəmizdə, qoymayacam anamgil korluq çəksinlər.

...Amma əvvəlcə oxumaq, orta məktəbi bitirmək, sonra həkim olmaq üçün ali məktəbin qapısını açmaq lazım idi. 1956-cı ildə orta məktəbi gümüş medalla bitirməyi onu arzusuna, həkimliyə, elmə aparan yolda qazandığı ilk böyük uğur idi.

Bu yol isə 1939-cü ilin mayın 9-da qoynunda göz açdığı doğmaca kəndindən, Tovuz rayonundakı Aşağı Əyyubludan başlayırdı.

...Uşaqlıqdan, hələ orta məktəbdə oxuyarkən qəti fikirə gəlmişdim ki, hansı sənəti seçəcəmsə onun da alimi olacam. Bu fikir içimdən gəlirdi, qəlbən deyirdim. Həvəsim isə bayaq dediyim kimi baytar həkimi olmaq idi. Həmişə güclü maraq, güclü həvəs məni bu sahəyə çəkirdi. Bilirsiniz, axı, iraq olsun, insanın bir yeri ağrıyanda, dərdin dili ilə deyə bilir. Heyvanlar isə məlul-məhul durub baxırlar. Bax, bu anda, bu məqamda onların köməyində durmaq, dərdinə əlac etmək, elə insanın özünə xidmət etməkdir, həm də böyük savab qazanmaqdır. Aqillərdən biri deyib ki, həkimlər insanı, baytarlar isə bütün bəşəriyyəti xilas edir. Mən də çalışırdım, o amalla yaşayırdım ki, bu sahəyə, bu sahənin elminə yiyələnim. Amma, nədən, yolumu hardan başlayacağımı axtarırdım. Sözün düzü, bir məqamda tərəddüd də etdim.

Sənədlərimi Gəncədəki Həsən bəy Zərdabi adına Pedaqoji İnstitutun fizika-riyaziyyat fakultəsinə verdim. Qəbul olunduğumu biləndə, doğrusu, heç sevinmədim də. Axı, istək ayrı idi, arzularım başqa sahə ilə bağlı idi.

Onu da yaxşı başa düşürdüm ki, fizika, riyaziyyat aparıcı elmlərdir. Amma, neyləyəydim ki, heyvan xəstəliklərinə olan maraq məni özünə çəkirdi. Bir il həmin institutda oxuyarkən bir daha inandım ki, müəllimlik mənim sənətim deyil.

Elə, mən də, rəhmətlik anam demişkən, qəlbim tutduğu yolla getdim. Növbəti il Azərbaycan Kənd Təsərrüfatı İnstitutunun, indiki Azərbaycan Dövlət Aqrar Universitetinin, baytarlıq fakültəsinə daxil oldum.

... Əşrəf müəllim ilk kursdan əlaçı tələbə kimi müəllimlərin diqqətini çəkir. Sonrakı kursdan elmi dərnəklərdə, tələbə elmi cəmiyyətlərinin işində fəal iştirak edir. Əla oxuduğuna görə də Stalin təqadünə layiq görülür. Sonralar Lenin adına adlandırılan bu təqaüdü o institutu bitirənəcən alır.

Əşrəf müəllimin elmə, elmin zirvəsinə gedən yoldakı ilk addımları da həmin elmi dərnəklərdə, tələbə elmi cəmiyyətlərində atılmışdı. Elə onun ilk elmi məqalələri də bu dövrdə yazılıb çap olunmuşdur.

Əşrəf Məmmədli 1962-ci ildə İnstitutu fərqələnmə diplomu ilə bitirir. Bir müddət Kənd Təsərrüfatı Nazirliyində çalışdıqdan sonra 1964-cü ildə Azərbaycan Elmi Tədqiqat-Baytarlıq İnstitutunda, helmintologiya ixtisası üzrə aspiranturaya qəbul olunur. Bir elm sahəsi kimi helmintologiya onu çoxdan özünə cəlb edirdi. Bu da səbəbsiz deyildi. Böyük rus - Sovet · alimi, akademik K.Skryabinin elmi yaradıcılığının, onun zəngin elmi irsinin, xüsusən də bu görkəmli elm xadiminin "Моя жизнь в науке" adlı əsərinin alimimizin yaradıcılığına güclü təsiri olub.

Əşrəf Məmmədlinin elmi işi "Azərbaycanda qoyunların xabertioz, bunostomoz və ezofaqostomozu, onlara qarşı mübarizə tədbirlərinin işlənib hazırlanması" mövzusunda idi.

Alimimiz öz namizədlik dissertasiyasını 1968-ci ilə Tiblisidə, Gürcüstan Elmi-Tədqiqat və Tədris Zoobaytarlıq İnstitutunun Elmi şurasında böyük uğurla müdafiə edib baytarlıq elmləri namizədi elmi dərəcəsini alır.

Onu da qeyd edək ki, Əşrəf müəllimin elmi tədqiqat işlərinin nəticələri bu günün özündə də respublikamızın qoyunçuluq təsərrüfatlarında yuxarıda adı çəkilən xəstəliklərə qarşı mübarizədə geniş miqyasda, uğurla tətbiq edilir.

...Mənim iki elmi rəhbərim olub. Bunlardan biri, Şuşada tanınmış Qaibovlar nəslindən olan, çox təcrübəli və elmli, dedikcən də humanist və həssas insan, baytarlıq elmləri namizədi Ağa Cavad oğlu Qaibov idi. O birisi isə akademik K.Skryabin elmi məktəbinin yetirməsi, tanınmış helmintoloq, baytarlıq elmləri namizədi Yaqub Hacıyev oldu.

Yaqub Hacıyev sonralar iki elmlər akademiyasının, Azərbaycan Milli Elmlər Akademiyasının və Rusiya Federasiyası Kənd Təsərrüfatı Elmləri Akademiyasının həqiqi üzvü, akademiki seçildi.

Mənim helmintoloq alim kimi formalaşmağımda bu iki böyük insanla yanaşı, biologiya elmləri doktoru, professor Abbasəli Qasım oğlu Məmmədovun da mühüm rolu, təsiri vardı. Abbasəli müəllim həm də mənim əmim oğlu idi.

Allah hər üçünə rəhmət eləsin! Onların hər üçünün elmi yaradıcılığı Azərbaycan elminin zəngin səhifələrindəndir.

...1970-1980-cı illərdə bir müddət Respublika Kənd Təsərrüfatı Nazirliyi sistemində müxtəlif vəzifələrdə çalışsa da, Əşrəf müəllim istər respublika, istərsə də keçmiş İttifaq mətbuatında, elmi jurnallarda elmi məqalələrlə çıxış edir.

Əşrəf müəllimin elmi yaradıcılığında, onun apardığı elmi-tədqiqat işlərində maraq doğuran bir cəhət də var. Bu da başqa elmi sahələrin, elmi istiqamətlərin bunlarda öz

əksini tapmasıdır. Məsələn, respublikaya cins mal-qaranın gətirilməsi, saxlanılması, bəslənilməsi, yetişdirilməsi və sağlamlıqlarının qorunması ilə bağlı tədqiqatların aparılması və praktiki tədbirlərin hazırlanması problemlərinin elmi həllində bu özünü qabarıq göstərir. «Cins mal-qaranın saxlanılması, yetişdirilməsi, binalarda mikroiqlim parametrlərinin normativləri»nin işlənib hazırlanması da məhz həmin problemlərin həllinə yönəlib.

"İnəklərin yelin xəstəlikləri - mastitlər" əsəri Əşrəf müəllimin 30 il ərzində apardığı elmi araşdırmaların, axtarışların, tədqiqatların məhsuludur. Adı çəkilən problemin - elmi həlli, xəstəliklərə qarşı elmi əsaslara söykənən kompleks mübarizə tədbirləri sisteminin işlənib hazırlanması, bu mövzuda bir təlimat, iki tövsiyə, bir konsepsiya, bir icmal, iki plakat, çoxsaylı elmi-kütləvi məqalələr, 150 -dən çox elmi əsərlərin dərc olunması heyvandarlığa ciddi ziyan vuran, onun inkişafında böyük əngələ çevrilən həmin xəstəliklərin qarşısının alınmasında, müalicəsində müstəsna rol oynadı.

Bu mənada "Camış saxlanılan binalarda mikroiqlim paratemrlərinin optimal normativlərinin işlənib hazırlanması" elmi-tədqiqat əsəri də mühüm əhəmiyyət kəsb edir.

Yeri gəlmişkən, onu da qeyd edək ki, Əşrəf müəllim Az.ETHİ-nin "Sanitariya və yoluxmayan xəstəliklər" laboratoriyasında baş elmi işçi kimi çalışan zaman bu problemlərlə dərindən məşğul olmuşdur.

1980-cı ildən bu günə kimi Əşrəf müəllim həmin institutda Sanitariya, Ekspertiza və Ekologiya laboratoriyasının müdiri vəzifəsində çalışır.

Bu gün ciddi, qlobal bir problem kimi sanitariya və ekoloji məsələlərin elmi həlli böyük maraq doğurur. Laboratoriyada "Heyvanları və quşları xəstəliklərdən qorumaq üçün baytarlıq-sanitariya və ekoloji təhlükəsizlik sisteminin işlənib hazırlanması və tətbiqi" mövzusunda tədqiqatların aparılması da həmin maraqdan, indiki ekoloji problemlərin kəskinliyindən, bir sözlə, zamanın özünün tələbindən irəli gəlir.

Həmin istiqamətdə aparılan elmi-tədqiqatlar uğurla davam etdirilir və əldə edilən nəticələr, potensial imkanlar göstərir ki, gələcəkdə daha böyük elmi məsələlərin həll edilməsinə nail olunacaq.

Zamandan söz düşmüşkən, Əşrəf müəllim deyir ki, həmişə çalışmışam zamanla ayaqlaşam, həyatın nəbzini tutam. Amma, buna nə dərəcə də nail olmuşam, bax, onu deyə bilmərəm. O məsələlər ki, məndən asılı olub, həmişə həll etməyə müvəffəq olmuşam. Amma, o məsələlər də ki, kimdənsə asılı olub, hə, çətinliklər də, bax, onda qarşıma çıxıb. Bunların da izahı çox dərin olub. Durub bunları aydınlaşdırsaydım onda gərək elmə, yaradıcılığa sərf etdiyin vaxtın yarısından vaz keçəydim. Bu isə mümkün olan iş deyildi. Optimist, həyatsevər olmağım həmin çətinliklərin öhdəsindən gəlməyə mənə çox kömək etdi. Çətinliklərdən qorxmamaq, həyatdan, gözəlliklərdən zövq almaq gərəkdir. Bir elmi cümlənin, müddəanın gətirdiyi uğur, bax, həmin gözəllikdir. Nəvə qığıltısı, körpə səsi eşitmək hədsiz sevincdir, yaşamaqdır. Bütün bunların hamısı birlikdə həyat deməkdir, ömür yoludur.

Mən də çalışmışam ki, Ulu Tanrının verdiy ömür payını bir alim, bir insan kimi ailəm, elim-obam, xalqım, Vətənim qarşısında alnı açıq yaşayım, ömrümü elmə, onlara sərf edim!

**Əfqan** MƏMMƏDOV

# ARIÇILIQ MƏHSULLARININ İSTEHSALI VƏ İSTEHLAKI MƏDƏNİYYƏTİ

Şamil QULİYEV, *Azərbaycan Arıçılar İttifaqının sədri*

Dünya əhalisinin sürətli artımı, texnogen fəaliyyət və qlobal iqlim dəyişmələrinin mənfi təsirləri, ekoloji çirklənmələr nəticəsində əhalinin keyfiyyətli qida tələbatı təminatı və ərzaq təhlükəsizliyi ildən-ilə çətinləşməklə bəşəriyyətin əsas probleminə çevrilir.

Hazırda bütün dünyanı bürüyən və bir neçə il davam edəcəyi proqnozlaşdırılan qlobal maliyyə böhranı və onun nəticəsi olan iqtisadi böhranının bu problemlərin həllini daha da çətinləşdirəcəyindən xəbər verir.

Yaranmış şərait hər bir ölkədə daxili imkanları yenidən qiymətləndirməklə, elm və texnologiyanın son nailiyyətlərindən maksimum bəhrələnməklə, iki istiqamətdə ərzaq təhlükəsizliyi probleminin həllinə ciddi fikir verilməlidir:

-Kənd təsərrüfatına yararlı məhdud torpaq sahələrindən səmərəli və kompleks istifadə etmə sayəsində ərazi vahidindən daha çox miqdarda və çeşiddə keyfiyyətli məhsul istehsalına nail olmaq;

-Kənd təsərrüfatına yararlı torpaq sahələrinə nisbətən əraziləri dəfələrlə artıq olan və ənənəvi kənd təsərrüfatı sahələri üçün yararsız sayılan ərazilərdən yeni təsərrüfatçılıq yanaşmaları, prinsipləri və metodlarına istinadən əlavə məhsul istehsalına nail olmaq. İkinci istiqamət üzrə istifadə olunmamış potensial həddən artıq böyük olduğundan, ərzaq təminatının yaxşılaşdırması yolunda bu istiqamət olduqca perspektivlidir.

Tam əminliklə bildirirəm ki, qeyd olunan hər iki istiqamət üzrə mühüm uğurların qazanılmasına vəsilə ola biləcək təsərrüfat sahələrindən biri və bəlkə də birincisi arıçılıqdır. Məhz nə üçün arıçılıq?

Bunun üçün ölkəmizin tarixi keçmişinə qısa nəzər yetirsək, Azərbaycan ərazisində arıçılığın təsərrüfat sahəsi kimi təşəkkül tapma tarixinin çox qədim olduğunun, zəngin xalq təcrübəsinə söykəndiyinin və xalqımızın milli mentalitetinə uyğun təsərrüfat sahəsi olduğunun şahidi olarıq.

Məsələn arxeoloji qazıntılar zamanı tapılmış, Enolit dövrünə (7-8 min il bundan əvvəl) aid və mum qəliblərə tökmə üsulu ilə hazırlandığı sübut olunan bəzi metal əşyalar hələ o dövrdə belə Azərbaycan məişətində arıçılığın mühüm rol oynadığını və deməli təsərrüfat sahəsi kimi inkişaf etdiyini sübut edir.

Herodot (e.ə. 484-425-ci illər) Qafqaz`əhalisinin səbət və gil qablarda arı saxlamaları barədə yazmışdır.

IX-X yüzilliklərdən başlayaraq Azərbaycanda arıçılıq o qədər inkişaf etmişdir ki, istehsal olunan bal və mum daxili bazarın tələbini ödəməklə yanaşı, xarici ölkələrlə ticarətdə mühüm yer tutmuşdur.

XVII-XVIII əsrdə Azərbaycanda olmuş bir çox Avropa səyyahları burada çoxlu miqdarda yüksək keyfiyyətli balın istehsalından, ondan müxtəlif növ şirniyyat məhsullarının hazırlanması və bazara çıxarılması barədə məlumatlar verirlər.

İbn Fövqələ görə Azərbaycanda bal bir sıra ərzaq məhsulları ilə bərabər (yağ, qoz, fındıq, kişmiş və s.) region ölkələrindəki qiymətlərlə müqayisədə olduqca ucuz olmuşdur.




Tarixçi Şərafətdin Əli Yəzdiyə görə Teymur Beyləqanı tutarkən şəhərdə o qədər çox bal olmuşdur ki, qoşun istədiyi qədər götürdükdən sonra belə, orada bal ehtiyatı tükənməmişdir.

Hələ yaxın keçmişdə Şavrov yazırdı ki, cənubi qafqaz ölkələrində ən böyük arıçılıq təsərrüfatları Azərbaycanın Quba qəzasındadır (burada 15 min arı ailəsi olmuşdur).

Qeyd olunanlar onu göstərir ki, ölkəmizdə arıçılıq tarixən xalqımızın sevilən, region ölkələri ilə müqayisədə daha çox diqqət yetirilən və uğurlar qazanılan təsərrüfat sahəsi olmuşdur.

Təəssüf ki, tarixi uğurlar davam etdirilməmiş, region üzrə qazanılmış liderlik əldən verilmiş və ölkə arıçılığının hazırkı inkişaf səviyyəsi həm region ölkələri və həm də müasir dünya arıçılığı səviyyəsindən xeyli geri qalmışdır.

Hazırkı qəbuledilməz vəziyyətin yaranma səbəblərinin aydınlaşdırılması üçün ölkə arıçılığı ilə müasir dünya arıçılığı arasında arıçılıq məhsullarının istehsalı və istehlakı mədəniyyəti üzrə müqayisə xarakterli bir sıra paralellər aparaq.

Arıçılığı inkişaf etmiş bütün ölkələrdə, arıçılıq kənd təsərrüfatının ən perspektivli və strateji əhəmiyyətli sahəsi kimi qəbul olunur; daim sahə üzrə ölkənin potensial imkanlarının düzgün qiymətləndirilməsi aparılır və onun artırılması yolları aranır; arıçılığın inkişafı üçün gərəkli maliyyə dəstəyi müntəzəm olaraq təmin edilir; elmi-texniki nəaliyyətlərin və müasir texnologiyaların tətbiqi, planlı tənzimlənmə, kadr siyasəti, koordinasiya və idarəçilik məsələləri vaxtında və əsaslı şəkildə həll olunur.




Ölkəmizdə yuxarıda qeyd olunan məsələlərin həlli üzrə hansı isə bir elementar uğurdan belə danışmaq mümkün deyil.

Müasir arıçılıqda ərzaq və müalicə əhəmiyyətli arı məhsullarının bütün çeşidləri üzrə eyni dərəcədə, yüksək tələbatlı standartlara uyğun, sənaye istehsallı təsərrüfatçılıq sistemi təmin olunur. Xarici təcrübə göstərir ki, balla bərabər digər arıçılıq məhsullarının (çiçək tozu, barəmum, arı südü, arı zəhəri və s.) istehsalından da yüksək gəlir alınması mümkündür və hətta bəzi ixtisaslaşmış təsərrüfatlarda digər arı məhsullarından alınan gəlir bal istehsalı üzrə alınan gəlirdən dəfələrlə çox ola bilir.

Bu təcrübənin də ölkəmizdə tətbiqi səviyyəsi çox aşağıdır. Bizdə arıçılıq dedikdə demək olar ki, təkcə bal düşünülür, arıçılığın digər məhsulları üzrə böyük potensialı və arının entomofil bitkiləri tozlandırması ilə kənd təsərrüfatına və ətraf mühitə verdiyi əvəzolunmaz xeyri barədə məlumatsızlıq nəticəsində ölkəmizdə arıçılığın faydası yetərincə qiymətləndirilmir.




Geriliyi aradan qaldırmaq üçün arı südü, çiçək tozu, barəmum (propolis), arı zəhərinin yüksək səviyyədə istehsal və istehlakını şərtləndirən və stimullaşdıran tədbirlərin həyata keçirilməsi vacibdir.

Müasir arıçılıqda pətəyin içərisindən başlayaraq tükəticiyə qədər arıçılıq məhsullarının istehsalı prosesinin bütün mərhələlərində (məsələn: balın pətəkdə yetişməsi, pətəkdən alınması, tədarükü, daşınması, saxlanması, emalı, qablaşdırılması və marketlərdə satışı) kəmiyyət, keyfiyyət, ekoloji təmizlik, müalicəvi yararlılıq, əmtəəlik görüntü, təklifdə məzmun və forma çoxçeşidliliyini təmin edən tələblər əsas götürülür.

Bu sahədə də ölkəmizdə uğurdan danışmaq hələ çətindir.

Arıçılığı inkişaf etmiş bütün ölkələrdə arıçının bir nömrəli problemi-istehsal olunan arıçılıq məhsullarının satışı, əvvəlcədən bağlanılmış müqavilə şərtləri əsasında tədarükçüyə bir yerdən sata bilməsi şəkilində həll olunub.

Tədarük mexanizminin qurulması arıçını qablaşdırma və marketinq işinə sərf edilsi vaxtdan və vəsait xərcindən azad edir, əldə olunan qənaət hesabına daha miqyaslı və çeşidli məhsul istehsalı planlaşmasını qura bilir və tədarükün tələblərinə uyğun keyfiyyətli məhsul istehsalına nail olur.




Ölkəmizdə isə arıçı uzun illərdir ki, istehsal etdiyi arıçılıq məhsullarını satmaq üçün bazar iqtisadiyyatı tələblərinə uyğun qablaşdırma və marketinq işləri kimi problemlərin həlli ilə təkbaşına qalıb.

Xüsusi olaraq vurğulamağı lazım bilirəm ki, arıçı miqyaslı vəsait qoyuluşunu və mürəkkəb texnoloji proseslərin tətbiqini tələb edən arıçılıq

məhsullarının emalı, qablaşdırılması və marketinqi işini heç vaxt tələb olunan standartlar çərçivəsində təkbaşına həll etmək iqtidarında ola bilməz.

Azərbaycan arıçısının bu imkansızlığının nəticəsidir ki, minbir əziyyətlə, gözəl təbiətimizdən yığılan, çeşidlilik zənginliyi ilə seçilən, bir-birindən gözəl və minbir dərdin dərmanı olan balımızın üzünə ölkədəki iri ərzaq ticarəti mərkəzlərinin qapısı bağlı qalır. Beləliklə arıçılarımız istehsal etdikləri məhsullarını öz ölkələrində normal realizə etmək kimi özəl haqqlarından məhrum olurlar.

Nəticə isə daha acınacaqlıdır. Keyfiyyətcə bizim baldan hər bir cəhətdən aşağı səviyyədə olan, adətən həqiqi tərkibi ilə etiketi üzərindəki göstəriciləri uyğun gəlməyən, itehlakçılarımızın sağlamlığı üçün təhlükə mənbəyi olan, amma yüksək səviyyədə qablaşdırılan xarici ballar bu ticarət mərkəzlərindəki boşluğu asanlıqla doldurur.

Sual olunur nə üçün belə olur, səbəb nədədir, günahkar kimdir və nə etməli?

Yaranmış vəziyyətə daha bir aydınlıq gətirmək üçün 2008-ci ildə ölkəmizdə yaşanmış bir olaya diqqətinizi çəkmək istəyirəm. Hamıya məlumdur ki, 2008-ci ildə televiziya kanallarında və mətbuatda belə bir informasiya yayıldı ki, Azərbaycandan Malaziyaya 300 ton bal satılacaq. Həmin vaxt məsələyə münasibətimizi bilmək istəyəndə biz qəti şəkildə bildirdik ki, ölkəmizdə bal istehsalı, emalı və qablaşdırılması səviyyəsi beynəlxalq standartlara və bal ticarəti tələblərinə heç cür uyğun olmadığından bu ticarətin baş tutması mümkün deyil. Nəticə isə göz qabağındadır, 300 ton bal hələ də satılmayıb.

Azərbaycan Arıçılar İttifaqı arıçılarımızın bu əsas probleminin köklü şəkildə həlli üçün dəyəri 1,1 mln. manat, illik istehsal məhsuldarlığı: 1000 ton bal, o cümlədən 400 t ixrac təyinatlı, 4 t çiçək tozu, 0,5 t barəmum (propolis) və 250 kq arı südü olan “Arıçılıq məhsullarının Avropa standartlarına uyğun emalı, qablaşdırılması və marketinqi” adlı layihəni hazırlamışdır.

Layihənin həyata keçirilməsi ölkəmizdə arıçılıq məhsullarının istehsal mədəniyyətinin yüksəlməsinə, hazırda böyük vüsət almış və hərtərəfli ziyanlı olan bal adı altında saxta məhsulların satışının qarşısının alınmasına və ümumən arıçılığın inkişafına ciddi təkan verəcək.

Azərbaycan Arıçılar İttifaqı Layihənin həyata keçirilməsinə yardımçı ola biləcək əlaqədar qurumları, təşkilatları və iş adamlarını iş birliyinə və qarşılıqlı faydalı əməkdaşlığa çağırır.

Tarixən xalqımız arıçılıq məhsulları üzrə yüksək istehlak mədəniyyətinə malik olmuşdur. Xalqımızın qida rasionunda bal xüsusi yeri olan, əhəmiyyətli dərəcədə tükətilən və digər yeyinti məhsullarının hazırlanmasında geniş istifadə edilən ərzaq məhsulu olmuşdur.

Xalq təbabətimizdə bal və digər arı məhsulları bir çox xəstəliklərin müalicəsində əsas müalicə vasitəsi qismində istifadə edilmişdir.

Tarixin bütün dövrlərində müdrük insanlar arı məhsullarını insanlıq üçün zəngin şəfa mənbəyi kimi qiymətləndirmişlər.

Peyğəmbərimiz həzrət Məhəmməd ə.s. bal haqqında hər kəsi düşündürən və heyrətə gətirən bir neçə hədisi var:

-"Siz (ey hümmətim) iki şeyə üstünlük verin, biri Quran, digəri bal";

-"Bal və sənaməkkidən istifadəyə davam ediniz, onlar ölümdən başqa bütün dərdlərə şəfadırlar";

-"Bədəndə bal olan öldükdə o cəsədi cəhənnəm odu yandırmaz";

-"Bütün dərmanların şahı baldır".

Hazırda isə ölkəmizdə adam başına bal istehsalı və tükətimi 150 qramdır ki, bu da orta dünya göstəricisindən iki dəfə, inkişaf etmiş digər ölkələrin göstəricilərindən isə daha azdır. Məsələn adam başına bal istehlakı göstəriciləri ABŞ-da 1,2 kq Almaniyada 2 kq, Yaponiyada 3 kq-dır. Digər arı məhsullarının istehlakı üzrə göstəricilərimiz isə başqa ölkə göstəriciləri ilə müqayisədə yox dərəcəsindədir.

Dünyada söz sahibi olan bu dövlətlər millətinin sağlamlığı və gələcəyi naminə arı məhsullarından qiymətli ərzaq və müalicəvi qida məhsulu qismində geniş istifadə edirlər. Yaponiyada hər bir məktəblinin gündəlik qida rasionunda baldan istifadə təmin olunur. Bu ölkədə bütün əhalinin müntəzəm olaraq dövlət tərəfindən qəbul olunmuş normada arı südü təminatı həyata keçirilir. Nəticə isə göz qabağındadır, əmək şəraiti və yaşam tərzi olduqca gərgin keçən və yüksək dərəcədə sənayeləşmənin mənfi təsirlərinə məruz qalmasına baxmayaraq, yaponlar dünyanın ən uzun ömürlü xalqına çevrilmişlər.

Arıçılıq məhsullarının istehlak tələbinin və mədəniyyətinin artırılmasında arıçılığın informasiya vasitələrində təbliği də əsas rol ounayır. İnkişaf etmiş ölkələrdə müntəzəm və sistemli şəkildə arıçılığın və arı məhsullarının insan sağlamlığı, iş qabiliyyətinin artırılması, qiymətli qida məhsulu, xəstəliklərlə mübarizə, bitkilərin məhsuldarlığının və meyvələrinin keyfiyyətinin yaxşılaşdırılması və ətraf mühitin qorunmasında alternativsiz rolu barədə geniş maarifləndirmə işləri aparılır.

Kütləvi informasiya vasitələrində və dövrü mətbuatda sahə üzrə mütəxəssislər tərəfindən arıçılığa aid xüsusi proqramlar, kampaniyalar və nəşrlər çərçivəsində aparılan təbliğat səmərəli nəticələr verir.

Təəssüf ki, bu sahədə də bizdə aparılan işlər yarıtmaz vəziyyətdədir. İnformasiya vasitələrində arıçılığa aid verilən məlumatların əksəriyyəti peşəkarlıq, dəqiqlik, aktuallıq, dürüstlük, yararlılıq və faydalılıq baxımından olduqca aşağı səviyyəlidir. İnternet səhifələrindən arıçılığa dair kütləvi informasiya vasitələrində verilmiş məlumatlara diqqət yetirdikdə aşağıdakı gülünc və üzüntü doğuran vəziyyətlə qarşılaşırıq:

- Mötəbər mənbələrə istinadən xəbər verilir ki, Azərbaycanda 2006-cı ildə bal istehsalı 10 min tonu keçib, yaxın illərdə bal istehsalı həcmi 40 min ton olacaq və digər bir mənbə isə bu göstəricinin 50 min ton olacağı qənaətindədir.

Bəs həqiqət nədən ibarətdir? Mütəxəssislərin hesablamalarına görə son 10 ildə ölkədə illik bal istehsalı 1300 tondan yuxarı olmamış və gələcəkdə isə bu göstəricinin 15 min tondan artıq olması mümkün görünmür. Bu qədər yalnış və şişirdilmiş rəqəmlərin kütləvi informasiya vasitələrində verilməsi yaxşı heç nə vəd

etmir, sadəcə sahə üzrə məlumatsızlıqdan, məsuliyyətsizlikdən və bəlkə də jurnalist səhlənkarlığından başqa bir şey deyildir.

-Son zamanlar telekanallarda arıçılığa dair verilişlərin getməsi artmışdır. Ancaq bu verilişlərin mahiyyəti, qayəsi və məzmunu olduqca aşağı və reallığı əks etdirməyən səviyyədədir.

Baxırsan ki, arıçılığa aid veriliş gedir, yüz minlərlə izləyiciyə arıxana və arıçı bəh-bəhlə təqdim olunur. Anlaşılan isə tam əksi: antisanitariya şəraitli arıxana; otuz-qırx il istifadə olunan, köhnə, çürümüş, dağılmış yerləri mal peyini ilə tutulmuş, xəstəlik mənbəyi sayılan qeyristandart pətəklər; müasir arıçılıq barədə anlayışı olmayan, danışığında isə izləyici üçün maraqlı və faydalı bir kəlmə belə tapılmayan savadsız arıçı.

Hörmətli kanal rəhbəri bilməlidir ki, belə verilişlərin efirə verilməsi arıçılığımıza, arıçımıza, arı məhsullarımıza və ümumən dövlətçiliyimizə qarşı ciddi zərər gətirən əks təbliğatdır; istehlakçıların arıçılarımıza və arı məhsullarımıza olan etibarını qırmaqdır və son nəticədə kanalımıza olan inamın və hörmətin itirilməsidir.

Azərbaycanda yüzlərlə müasir dövrün tələblərinə cavab verən və göz oxşayan arıxanalar; təcrübəli, savadlı, peşəsinin vurğunu olan və ölkədə istehsal olunan arıçılıq məhsullarının 80%-ni verən arıçılarımız vardır. Sadəcə peşəsinə hörmət etmək, işinə məsuliyyətlə yanaşmaq, bir az əziyyətə qatlaşmaqla belə arıxanaları və arıçıları çəkib efirə verməli və arıçılıq layiq olduğu kimi təbliğ edilməlidir.

Kütləvi informasiya vasitələrinin və mətbuatın əhali arasında arıçılığın və arıçılıq məhsullarının təbliğində, istehlak mədəniyyətinin artırılmasında və ümumiyyətlə maarifləndirmədə böyük imkanlara malik olması xarici ölkələrin təcrübəsində çoxdan özünü doğrultmuşdur.

Ölkəmizdə bu təcrübənin tətbiqi üçün, arıçılığın təbliğinə dair hazırlanmış arıçılıq kampaniyaları çərçivəsində telekanallarda arıçılığa aid silsilə verlişlər təşkil olunmalı, verilişlərdə sahə üzrə mütəxəssislərin iştirakı təmin edilməli, peşəkarlıqla arıçılıq məhsullarının xüsusiyyətləri, onların hər birinin qida və müalicəvi əhəmiyyəti, istifadə olunma sahələri və qaydaları barədə istehlakçıların ətraflı məlumatlandırılmasına nail olunmalıdır.

İstehlakçıların məlumatlandırılmasında qəzet və jurnalların imkanlarından da geniş istifadə edilməlidir. Arıçılığa dair jurnal və ya qəzet şəklində dövrü nəşrin olması da müsbət nəticələr verərdi.

Sonda isə onu bildirmək istəyirəm ki, millət o vaxt böyük olur ki, o özünü təmin etməklə bərabər özgəsini də təmin edərək qazanclı ola bilir. Başqasının artığı ilə razılaşmaqla böyük olmaq olmaz. Yazının əvvəlində millətimizin arıçılıq sahəsində böyüklüyünü sübut edən kifayət qədər dəlillər gətirmişəm. O böyüklüyə bir daha qayıtmaq və onu əbədi yaşatmaq naminə sahə üzrə cavabdeh olan və töhvə vermək imkanlı hər kəsi vicdanının səsinə qulaq asmağa və qeyrət göstərməyə çağırıram.

# SÜDLÜK VƏ ƏTLİK NAXIRLARI NECƏ YARATMAQ OLAR?

**Suliddin ABBASOV**, *k/t.e.n.dosent.Asərbaycan Dovlət Aqrar Universiteti*
**Aqil Mehdiyev**, *elmi işci. Azərbaycan Elmi Tədqiqat Heyvandarlıq İnstitutu*

Respublikamızın ekstremal şəraitini nəzərə alaraq əhalinin ət və süd məhsullarına olan tələbatını ödəmək üçün, genetik resurslardan istifadə olunaraq yeni tip və qrupların yaradılması alim və mütəxəsislər qarşısında duran önəmli məsələdir.

Azərbaycanda mövcud qaramalın məhsuldarlığını yüksəltmək dözümlü ,xəstəliyə tutulmayan,tezyetişgən,təbii-iqlim şəraitli bitgi növlərindən səmərəli istifadə edən,uzunömürlü naxırların yaradılması fermer təsərrüfatlarında və heyvandarlıqla məşğul olan mütəxəssislər üçün qarşıda duran ən aktual problemdir. Belə naxırların yaradılması dünya maldarlığında son illərdə hibridləşmə yolu ilə zebu əsasında yaradılmış cins və tiplərə əsaslanır.

Bu günlər əgər dünya maldarlığının dinamik inkişafının hansı əlverişli istiqamət yoluna nəzər salmasaq, yenədə respublika maldarlığında heç bir irəlləyişə,damazlıq naxırların yaradılmasını gözləyə bilmərik.Yenədə xaricdən gətirilmiş Holştin-friz,simmental,Qara-ala və.s cinslər heç vaxt öz genetik potensial imkanını göstərə bilməyəcək. Buna əsas səbəb ilkin növbədə həmin cinslərin mühütə uyğunlaşa bilmə xüsusiyyətlərinin az olması, ikinci onlar üçün lazımı balanslaşdırılmış yemlərin olmaması ilə bağlıdır .Eyni zamanda heç bir təsərrüfatlarda genetik təhlilərin (seleksiya,prepotentlik,irsən keçmə,nəslin keyfiyyətinə görə qiymətləndirmə və.s. ) aparılmamasıdır. Xaricdən gətirilmiç qaramal cinslərinin hansı formada yetişdirilməsi proqramı yoxdur.Bu isə fermer və dövlət təsərrüfatlarında hansı istiqamətdə və hansı regionlrda yetişdirilməsi əhəmiyyətini aşağı salır.Məsələn Hindistana 35 ildən çox bir dövürdə plansız olaraq Holştin cinsi daşınmış ancaq heç bir müsbət nəticə alınmamışdır.Sonralar alimlərin fikri ilə razılaşaraq , Şfis buğaları ,qırmızı sindi və sahival inəkləri ilə cütləşdirilərək həmin şəraitə dözümlü Karanşvis cinsi yaradılmışdır.Dünyanın bir çox dövlətlərində ABŞ,Brazilya ,Avstraliya ,Yenizellandiya ,Argentina və.s maldarlığın yüksək inkişaf tempini ancaq zebu əsasında hibridləşdirmənin aparılması yolu ilə nail olmuşlar.Əgər hər hansı bir cinsin süd məhsuldarlığını 1000kq artırmaq üçün seleksiya yolu ilə 40-50- il tələb olunursa ,hibridləşmə yolu ilə 15-20 ilə buna nail olmaq mümkündür.

Hibridləşmə dünya təcrübəsində ən geniş yayılmış biotexnoloji üsul olmaqla, qısa müddət ərzində mühütə tez uyğunlaşan hibrid naxırların

yaradılması üçün geniş tədbiq olunan yetişdirmə üsuludur. Hibridləşmə zamanı müxtəlif genotipli valideyin formaların çarpazlaşdırılması nəticəsində bioloji heterozis hadisəsi baş verir. Heterozis zamanı alınan hibridlərdə yüksək böyümə xüsusiyyəti həyata dözümlülük, balavermə, möhkəm konstitusiya yüksək məhsuldarlıq və xəstəliklərə dözümlülük özündə göstərir və valideyin formalarından üstün olurlar. Valideyinlərdən qazanılmış əlamətlərin kombinasiyası heterozisə səbəb olur. Bu heterozis hibrid qüvvəsi ilə biruzə verir. Zebunun və zebunövlü malın Dünyanın bütün qitələrində ağır iqlim və əlverişsiz yemləmə şəraitində çox böyük tarixi dövr ərzində müvəffəqiyyətlə yetişdirilməsinin əsas səbəblərindən biri onun artıq irsi xarakter almış bir sıra qiymətli bioloji xüsusiyyətlərə malik olmasıdır. Qaramal cinslərindən fərqli olaraq zebu bir şəraitdən başqa şəraitə düşdükdə öz qiymətli xüsusiyyətlərini zəifl ətmir və ya itirmir, hətta onları yerli şəraitlə əlaqədar olaraq bir qədər təkmilləşdirir və möhkəmləndirir. Bununla bərabər zebu düşdüyü yeni şəraitin təsiri ilə yeni faydalı xüsusiyyətlər qazanır. Bütün bunlar zebunun yüksək dərəcədə iqlimə uyğunlaşma qabiliyyətinə malik olmasını təmin edə bilmişdir. Bu isə zebunun Dünyanın əksər rayonlarında müvəffəqiyyətlə yayılması ilə nəticələnməsidir. Əgər son 100-idə yaradılmış cinslərin Brhaman, Santa-hertruda, Bifmaster, Branqus, Braford, Şarbrey, Kanşem, İbadje, Bramuzin, Mandalonq Karanşvis, Siboney, Yamayka-xoup, Hollandqir, Okamora və s. qan dərəcələrini təhlil etsək məlum olar ki, bu cinslərin əsası zebuqanlıdır.Heçdə təsadüfü deyildir ki, Hindistanda 193 milyon başdan yuxarı qaramal vardır ki, bununda 99% zebuqanlı,Brazilyada 153 milyon başdan 80%-ə qədəri zebu qanlı hibritlərdən ibarətdir. ABŞ-da 100 milyon ,Avstraliya da-77-milyon başdan çox qaramal zebuqanlı heyvanlardan ibarətdir.Bu onu göstərir ki, inkiçaf etmiş ölkələrin maldarlığında zebuqanlı heyvanlar yüksək bioloji-təsərrüfat xüsusiyyətlərə malik olmasıdır.Eyni zamanda dünyanın inkişaf etmiş ölkələrində zebu növlü maldan istifadə edərək yüksək məhsuldar mühütə dözümlü cins heyvanlar yaratmaqla ekoloji təmiz ət və süd məhsulları ilə yanaşı tibbə vacib olan insulin pepsin və s. kimi məhsulların alınmasıdır. Dünya təcrübəsinə nəzər yetirsək və son 50 ildə ölkələrdə yetişdirilən cinslərin genotipini təhlil etsək aydın olar ki, yer üzərində mövcud olan qaramalın 60%-dan çoxu (655 mil) zebu qanlı heyvanlardan ibarətdir. Zebu növlü heyvanlar öz müsbət bioloji və təsərrüfat xüsusiyyətlərinə görə ekvatordan 30-35° şimala və cənuba doğru bir ərazidə yerləşmişdir. Zebu növlü mal dünyanın bütün qitələrində ağır iqlim və əlverişsiz yemləmə şəraitində çox böyük tarixi dövr ərzində müvəffəqiyyətlə yetişdirilmişdir.Xüsusən 62 dövlətin naxırının 20% qədəri bruselyoz xəstəliyə tutulmaları belə zebu naxırları üçün təhlükəsizdir. Qaramal cinslərindən fərqli olaraq zebu və hibridlər bir şəraitdən başqa şəraitə düşdükdə öz qiymətli xüsusiyyətlərini müəyyən qədər təkmilləşdirir və möhkəmləndirir. Bununla bərabər zebu növlü heyvanlar düşdüyü şəraitin təsirindən yeni faydalı xüsusiyyətlər qazanır.

Aparılan bir çox tədqiqatlardan (A.Ağabəyli, Z. Verdiyev, R.Buynaya, E.Əliyev və b.) aydın olur ki, zebu növlü heyvanların qanında leykositlərin faqositar bakterosit və lizosim fəallığı xeyli yüksəkdir. Ona görə də zebular yoluxucu xəstəliklərə dözümlüdür. E. A.Əliyevin apardığı biokimyəvi immunobioloji tədqiqatlarla müəyyənləşdirmişdir ki, Azərbaycan zebusu və onun hibridləri brusellyoz kimi kəskin yoluxucu və geniş yayılmış xəstəliyə qarşı da davamlıdır. Brusellyozla xəstələnmə halları qaramal və camış naxırında uyğun olaraq 9,3 və 6,1 % olduğu halda, zebu və hibridlərində 0,5 -1,0 %-dan çox olmur. Xəstəliyə zebu hibridləri 1 - 3% təsadüf edilir, zebu piraplazmoz, babenoz-anaplazmoz xəstəliklərini çox yüngül keçirir, F.Xatt zebunun qan parazitar xəstiliklərə qarşı təbii davamlılığını onlarda həmin xəstəliklərin anadangəlmə törədicisi olan gənələri dəfetmə qabiliyyətinin olması ilə əlaqələndirir.

Amerika alimi F.Xatt (1949) 1931-1936-cı illərdə apardığı tədqiqatlarla müəyyən etmişdir ki, Uqandada (Afrika) 6185 başlıq Angel cinsi mal naxırında vərəmlə xəstələnmə 17% təşkil etdiyi halda, həmin şəraitdə yetişdirilən 26079 başlıq zebu naxırlarında vərəmə tutulma cəmi 0,9 % olmuşdur.

1986-cı ildə Xanlar rayonun Qovular təsərrüfatında qaramal naxırında vərəmə tutulmuş 223 baş Qafqaz qonuru cinsi ilə 175 baş zebu hibridləri birlikdə saxlanılmışdır. Eyni şəraitdə saxlanmış zebu hibridlərinin ancaq bir başı vərəmə yüngül tutulmuşdur (S.Abbasov, 1998).

Zebu və hibridlərin istiliyə dözümlülüyü başqa növ heyvanlara nisbətən yüksəkdir. Bu xüsusiyyət tam aşkar olunmayıb. Ancaq məlumdur ki, bu üstün xüsusiyyət onda kompleks faktorlara görə baş verir. Əsas əlamətlərdən biri onun canlı kütləsinə görə böyük dəri sahəsinin olmasıdır.

Son dövrlərdə dünya rekordçusu mühitə dözümlü və uzun ömürlü Siboney cinsi (Holştin x Kuba zebusu) yaradılmışdır. Bu cins Kubanın Kartaxena təsərrüfatında III laktasiyada Ubre Blank adlı (ağ yelin) inək 27674 kq süd vermişdir. Avstraliyada yaradılmış ən məşhur ətlik cinslərdən biri də Mandalonq cinsidir. 5 cinsli hibridin qanında məşhur ətlik cinslərlə yanaşı Amerika zebusu qanı qatılmışdır. 8-aylıqda cavanların çəkisi - 350 kq-ma çatmışdır ki, bu da məşhur Şarole cinsindən 49 kq, Hereford cin-sindən 89 kq-dan çox həmin dövrdə canlı kütlə deməkdir. Eyni zamanda həmin hibridlərin kəsim çıxarı 68 %-dək yuxarı olmuşdur. Bu isə ətlik cinslərdən 6,8 - 8,6 % əlavə kəsim çıxarı deməkdir.

Respublikamızda da Azərbaycan zebusu və Kuba zebusu ilə aparılan dərin elmi tədqiqat işləri müsbət nəticə vermişdir. Hibridlər 18-aylıqda 420-440 kq canlı kütləyə çatırlar ki, bu da ana tərəfin həmyaşıdlarından 60-80 kq əlavə canlı kütlədir. Hibridlərin kəsim çıxarı 59-62 % arasında tərəddüd edir. Bu da hibridlərin yüksək cəmdək çıxarma malik olmasını göstərir. Respublikamızda aparılan tədqiqatlarda Qafqaz qonuru, Qara - ala, Kostroma, Sim-mental cinslərindən alınmış hibridlər kliniki göstəricilərinə və törəmə qabiliyyətinə görə valideyin formalarından üstün olmuşdur.

Aparılan və apardığımız tədqiqatlardan aydın olur ki, zebu hibridlərində hemotoloji (hemoqlobin, eritrosit, leykosit və s.) göstəricilər həmişə qaramala nisbətən yüksək olmuşdur. Bu da hibridlərin mühitə dözümlülüyü, tez uyğunlaşması ilə yanaşı, yüksək böyümə dinamikasına səbəb olan əsas əlamətlərdəndir (S.Abbasov, 2003.).

*Eyni zamanda tez yetişən , mühitə dözümlü , uzun ömürlü damazlıq heyvanların alınması üçün Yüksək məhsuldar cinslərin Azərbaycan və kuba zebu törədicilərindən istifadə olunaraq planlı hibrid naxırların yaradılması daha böyük səmnərələliyə malikdirlər . Bir çox ölkələrdə aparılan hibridləşmənin əsas məqsədi yüksək məhsuldar hibrid naxırlar,cinslər yaradıldığı kimi respublikamızda da ancaq bu üsülla yeni cins və tiplərin yaradılmasına nail olmaq mümkündür.Başqa heç bir üsulla respublika da qaramalın inkişaf etdirilməsi qeyri mümkündür.Biz bunu apardığımız tədqiqatların müsbət naticələrinə əsasən təkif edirik.*

Respublikamızda yaradılmış hibridlər(kuba x qara-ala ;kuba x kostroma ;kuba x qavqaz qonuru ;kuba x aberdin –anqus x az.zebu ) öz böyümə dinamikasına , gündəlik çəki artimina ,çəki artimina sərf olunan yemə görə ,ətin yüksək zülalıq keyfiyyətinə ətin morfoloji xüsusiyyətinə cüdün quru maddəsinin zənginliyinə görə mədəni və yerli cinslərdən üstündür . Xüsusən hibridlərin ən əsas müsbət bioloji və təsərrüfat xüsusiyyəti ondan ibarətdir ki, onlara qüvvəli yem verilmədikdə belə onlar öz köklük kondisiyasını saxlayırlar ki bu da ekoloji baxımdan çox vacibdir.Məhs bu göstəricilər bir daha sübut edir ki, zebu ekstrimal şəraitə dözumlü olmaqla inkişaf etmiş dövlətlərdə olduğu kimi Respublikamızda zebu



əsasında ekoloji təmiz ət və süd məhsulları istehsal etmək məqsədi ilə yeni cins və tiplərin yaradılması çox aktual bir işdir I nəsil hibridlərin dişiləri fermer təsərrüfatın istiqamətindən asılı olaraq zonalara uyğun ətlik və südlük cinslər ilə mayalandırılır, II nəsil hibridlər 18 aylıqda ətlik erkəklərin canlı kütləsi 440-480 kq, dişilərin canlı kütləsi isə 310-350kq-açatırlar.

Ona görə də həmin hibridlərdə tezyetişkənlik üstün olduğu üçün həm ətlik və südlük dişi hibridlərin mayalandırılması və ya cütləşdirilməsi 13 aylıqda aparılır,və ya ananın canlı kütləsinin 60%-ə qədər canlı kütlədə mayalandırılır. Alınmış 1 nəsil dişi hibridlərin yemləndirilməsinə daha ciddi fikir verilməlidir. Belə ki, ətlik istiqamətdə dişi və erkəklər ana altında bəslənmə tədbiq olunmaqla iki aylıqdan sonra qüvvətli yem 0,5 yem vahidi və ya 5 meqacoyl zənginlikdə yemləndirilməyə başlanmalıdır

Dişilər gün ərzində çəki 500-650 qram nəzərdə tutulmaqla anadan ayrıldıqdan sonra tam qidalı yemləmə tətbiq olunmalıdır. Təsərrüfatın yem



bazasına əsasən a) ot və ya qarğıdalı silosu gündə 11-14 kq dən yemlərin qarışığı və protein əlavəsi 1,5-2,0 kq; b) yonca otu 5-7 kq, qarışıq (qüvvəli) yem 1,5-2,0 kq; c) orta keyfiyyətli silos 9-11 kq + ot – 1,5-2,0 kq + qüvvəli yem 1,5-2,0 kq; q) senaj orta keyfiyyətli 6-8 kq+ saman bişmişi + qarışıq yem 1,5-2,0 kq verilməsi məsləhətdir. Orta hesabla 100 kq canlı kütləyə 0,9-1,10 kq quru maddə və ya 0,8-0,9 yem vahidi (9,0-11,5 meqacoyl) tələb olunur. Dişi hibridlər yaxşı yemlənmə təşkil olunmaqla onların seçilməsi də düzgün aparılmalıdır. Ətlik hibridlərin seçilməsində dişilərin bədən quruluşu konstitusiyası bədənin möhkəmliyi, əzələliyi, döş eni, döşün dərinliyi, buxaqların sayı, cidov hündürlüyü (hürgücün olması) eni və forması dərinin qalınlığı, eyniliyi, boynu enli dolu bel nahiyyəsinin düzlüyü əsas götürülür.

Hibridləşmə nəticəsində əldə olunan hibridlər ət və süd məhsuldarlığına görə fərqləndiyi kimi keyfiyyətli xam dərisinə görədə fərqlənirlər.

S.Abbasovun (1988-2003) apardıqları tədqiqatlarda göstərmişdir ki, zebu hibridlərinin dərisi əmtəə texnoloji xüsusiyyətlərinə görə qaramal və camış dərisindən keyfiyyətlidir. Tədqiqatlarına əsasən 15 və 18 aylıqda kəsilmiş Kuba zebu hibridlərin dərisinin yüksək əmtəə-texnoloji xüsusiyyətə malik olmasını göstərmişdir.

Dəri texnologiyasında dəri qalınlığı əsas rol oynamır. Burada əsas keyfiyyət hansı qatların zəngin olmasından asılıdır. S.A.Abbasovun tədqiqatlarından üç cinsli (Kuba zebu X Aberdin-angus X Az. zebu) hibridlərin dəri qalınlığının iki cinsliyə nisbətən çox olmasını qeyd edir.

H.Petruşenko (1987) apardığı tədqiqatlarda Qırmızı səhra və onun zebudan alınmış hibridin dərilərinin müqayisəli əmtəə-texnoloji xarakterizəsində çarpazlaşdırma və hibridləşdirmə zamanı alınmış dəri məhsullarının keyfiyyətli olmasını göstərmişdir.

Mələz və hibrid dərilərinin keyfiyyət göstəricilərinin əsasını fiziki-mexaniki möhkəmliyə layiq olmasıdır. Məhs belə dərilər sənaye texnologiyası üçün çox əhəmiyyətli təsiri vardır. Eyni zamanda mələz və hibrid dəriləri ağır çəkili dərilərə aid olmuşdur.



Südlük istiqamətli dişi hibridlərdə baş incə, alın ensiz, uzun boyun, uzun - nazik dəri, normal düz duruşlu buxaq, yaxşı inkişaflı cidov hündürlüyü (hürgüc) his olunmaqlı döş yaxşı inkişaflı, arxa (çanaq) yaxşı inkişaflı yelin həcmli, əmcəklər aralı, süd quyusu dərin, enli, vena damarı qalın hiss olunan səviyyədə görünməlidir. Ümumiyyətlə ətlik və südlük heyvanların seçilməsini daha ciddi fikir verilməlidir.

Südlük istiqamətli hibrid naxırlar orta hesabla laktasiyada süd məhsuldarlığı 5-6 min kiloqramma bərabər olurlar.Süddə yağ 4,5-5,0% arasında tərəddüd edilir.

Hibrid inəklərin I laktasiyada süd maldarlığı 2500 kq-dan çox olurlar.

Respublikamızda tədqiqatlar nəticəsində aldığımız hibrid naxırların müsbət nəticələrini əsas tutataq hazırda qərb bölgələrdə hibridləşmə üstünlüklərinə nail olunur .Akstafa rayonun "Atçılıq damazlıq" təsərrüfatın qaramal naxırlarında kuba zebusundan istifadə olunaraq böyük hibrid naxırlar yaratmışlar.Təsərrüfat rəhbərliyi və əhali hibridlərin yüksək səviyyədə mühütə uyğunlaşma qabiliyyətinə ,tezyetişgənliyinə,xəstəliyə tutulmamamasına görə belə naxırın yaranmasından şox razıdırlar.Çünki hibrid balalarda heç bir itgi baş verməyərək xəstələnmirlər.Məhz ona görədə bölgələrdə hibrid naxırların yaradılması üçün movcud qaramal cinslərinin kuba zebusundan istifadə olunaraq hibrid naxırların yaradılması işləri aparılır. Bu heyvanlar məhsuldarlığına mühütə dözümlüyünə, tezyetişgənliyinə, xəstəliklərə tutulmamasına, qabayemlərdən yaxşı istifadə olunmasına görə xaricdən gətirilmiş mədəni cinslərdən yüksək iqtisadi səmərəliliyə malikdir.Ona görədə respublikamızda ətlik və züdlük istiqamətli damazlıq naxırların yaradılmasını zebu əsasında aparılmasını təklif edirik.Dövlət ,fermer və sahibkarlar ancaq zebudan istifadə etməklə tezyetişgən ,uzunömürlü naxırlar yarada bilərlər.

**İstifadə olunan ədəbiyyatlar :**


1. Аббасов С.А. Эффективность скрещиванием Кубинских зебу с разными породами скота в условиях Азербайджана. Гянджа. 2003. 138 стр.
2. Аббасов С.А., Абилов А.И., Абдуллаев Г.Г., Йолчиев Б.С. Пути увеличения производства молоко и говядины в сководстве на основе зебу в предгорных и горных районах Азербайджана (рекомендации). Гяндьжа-2001, с. 24.
3. Аббасов С.А. Гибридизация в условиях Азербайдьана. Молочные и мясное скотоводства. М., № 4, 2002, с. 25-27.
4. Аббасов С.А. Использование зебу для увеличения молочной продуктивности скота в Азербайджане. Международный сельскохозяйственный журнал. М., № 3, 2002, с. 60-61.
5. Белоусов А.М. Мясная продуктивность Абердин ангусского и его помесей // Животноводство. 1982. № 9. с-49-50
6. Буйная П.Н. и др. Использование зебу в мясном скотоводстве // Зоотехния 1999 Вердиев З.К. Зебуводство, М.: Колос, 1986, 238 с.

7.Вердиев З.К., Салманов З.М., Аббасов С.А. и др. Зебувидные мясные гибриды в Азербайджане и использование их в увеличении производства мяса: Монография, Баку, 1991, 77 с. № 10. с.6-8.

8.Родригез Кампос Сальвадор Характеристика генетической структуры у животных гибридного стада.Автореферат.Москва-2009.24 стр.

9. Левантин Д.Л. Краткая аналитическим информация о развитии скотоводства и производстве молока и говядины в мире за период. 1990-1998.год.//Молочное и мясное скотоводство. 2000. № 3. с.30-31.

10. Легошин Г.П. Дзюба Н.Ф. Епифанов Г.В. Левантин Д.Л. и др. Научное обоснование мясного скотоводства и технологии производство говядины // Зоотехния-1999. № 8. с.9-10.

11. Рубенков А.А. Продуктивные качества зебувидного скота в Московской области // Животноводство. 1980. № 9. с. 31-

## XÜLASƏ

## SÜDLÜK VƏ ƏTLİK NAXIRLARI NECƏ YARATMAQ OLAR

*Abbasov S.A.* **k/t.e.n.dosent:Azərbaycan Dövlət AqrarUniversiteti.**
**Mehdiyev A.Q.elmi işçi;Az,E.T.H.İ.**
**Sadıqova G. İ.disertant:Az.D.A.U.**

Dünya maldarlığının uzun müddətli əsaslı nəticələri, yeni yaradılmış zebunövla ətlik və südlük hibridlərin müsbət bioloji və təsərrüfat xüsusiyyətləri,respublikamızda hibrid naxırların yaradılması yollarına istiqamətləndirir. Ona görədə dünya alimlərin təcrübəsinə və apardığımız müsbət nəticəli təcrübələrə əsaslanaraq pespuçlikamızda yüksək məhsuldar tez yetişgən ,usun ömürlü, normal törəmə qabiliyyətli hibrid naxırların yaradılması vacibdir.

Çünki hibridlər respublika ərazisində istənilən regionlarda öz müsbət prepotentlik xüsusiyyətini saxlamaqla ,yerli bitgi növlərindən səmərəli və yediyi yemi məhsula çevirmə qabiliyyətinə görə gətirilmiş mədəni cinslərdən çox üstündür.Eyni zamanda ancaq bu üsulla qısa müddət ərzində iqtisadi səmərəliyə malik damazlıq hibrid naxırları yaratmaq mümkündür.

# QARAMAL VƏ CAMIŞLARIN MƏHSULDARLIĞININ, BALAVERMƏ, ALINAN BALALARIN YAŞAMA QABİLİYYƏTİNİN YÜKSƏLDİLMƏSİ YOLLARI

**Ə.B.BƏŞİROV,** *Azərbaycan Heyvandarlar Assosasiyasının prezidenti, Rusiya Beynəlxalq Keyfiyyət Problemləri Akademiyasının həqiqi üzvü, akademik.*

Respublikamızda heyvanlarının məhsuldarlığının aşağı olmasının və sayının zəif artmasının başlıca səbəbləlindən biri də heyvanların qısırlığının çox yüksək olması və onlardan alınan balaların yaşama qabiliyyətinin yüksək olmamasıdır. Bunların səbəblərinin öyrənilməsinin qısırlıqla mübarizə, məhsuldarlığın artırılması tədbirlərinin işləyib hazırlamasının böyük elmi və təcrübəvi əhəmiyyəti vardır. Bu məqsədlə Neftçala indiki Xıllı rayonunun Xolqarabucaq kəndində apardığımız təcrübələrimiz göstərdi ki, bunların başlıca səbəbləri heyvanların lazımi yemləmə və bəsləmə şəraitləri ilə təmin edilməməsi, fermalarda kifayət qədər törədicilərin olmaması, onlardan (dörədicilərdən) düzgün istifadə edilməməsi heyvanların xəstəliklərinə qarşı lazımi mübarizə olmamasıdır.

Respublikamızın maldarlıq fermalarında belə səbəblər nəticəsində ana heyvanların çoxu doğandan sonra uzun müddət höyürə gəlmir, höyürə gələnlərin isə bir çoxunun vaxtında mayalanması təmin edilmir. Bunun da nəticəsində döllənmə faizi az, qısırlıq isə çox yüksək olur. Respublikada yüz minlərlə balaların alınmamasına, süd, ət, yun məhsuldarlığının aşağı düşməsinə və eləcə də kolxozların ümumi gəlirin aşağı olmasına səbəb olur. Buna canlı misal Xıllı (Neftçala) rayonunun Stalin adına kolxozunu gətirmək olar. 1954-1955-ci illərdə bu kolxozun formalarındakı heyvanların yemləmə şəraiti pis olduğu üçün (heyvanlar daima məhsuldar otlaq şəraitində saxlanıldığı və əlavə yem almadıqları üçün) onların 70 %-dən çoxu orta köklük dərəcəsindən aşağı olmuşdur. 27 baş doğar camışdan isə 5 ay ərzində yalnız 7-si, doğduqdan sonra höyürə gələrək mayalanıb döllənmişlər. Qalan 20 baş camış isə yalnız 9-10 aydan sonra yaz-yay aylarında çöldə otlaqlarda yaxşı yaşıl, tərkibində çoxlu vitamin olan otlarla yeməndikləri zaman höyürə gəlib döllənmişdilər. Həmin il heyvanların süd məhsulu çox aşağı oldu. Bu səbəblərə görə də həmin koxozda heyvandarlıqdan gəlir olduqca az olmuşdur. 1952-ci ildə Xolqarabucaq kəndində heyvandarları bizim məsləhətimizlə mal-qaranı növbəli örüş sistemindən istifadə edərək və heyvanlara əlavə yaşıl ot

verərək düzgün fizioloji tələbatına uyğun yemləmə və bəsləmə şəraitləri ilə təmin edildikləri ilə əlaqədar heyvanların məhsuldarlığı artırmağa və qısırlığı aradan qaldırmağa nail oldular. Hər bir baş inəkdən 3,5-3,8% yağlılıqla 693 kq, hər bir camışdan isə 9-10% yağlılıqla 963 kq süd sağa bildilər.

İnək və camışların köklükləri də orta köklük dərəcəsindən yüksək oldu. Həmin heyvanlar da doğandan 18-22 gün sonra höyürə gələrək mayalandılar. Beləliklə, həmin ili Stalin adına kolxozun üzvləri çoxlu məhsul əldə edərək əmək günləri hesabına külli miqdarda yağ, pendir, şor aldılar. Təkcə naxırçı Əzim Qasımov əmək günü hesabına 50 kq-dan çox kərə yağı almışdır.

Apardığımız təcrübələr və qabaqcıl maldarların iş təcrübələrinə əsaslanaraq nəticəyə gəlmək olur ki, inək və camışları sağılan zaman tərkibində çoxlu vitamin olan yaşıl şirəli və az miqdarda qüvvəli (1-2 kq) yemlərlə yemlədikdə onlardan yüksək süd məhsulu əldə etmək olur və həmin heyvanların fizioloji vəziyyəti, köklüyü normal olur, doğandan az müddət sonra höyürə gəlir, mayalanır və döllənirlər. Boğazlığın ikinci yarısında isə (həmin vaxt heyvanların qurutma vaxtının yaxınlaşma dövrünə düşür) heyvanların yem payından yaşıl yemin miqdarını çoxvldıb qüvvəli və şirəli yemlərin miqdarını isə əksiltmək lazımdır. Heyvanlar qurudan zaman və boğazlığın axırıncı dövründə isə yalnız tərkibində çoxlu vitamin olan yaşıl yemlərlə təmin olunmalıdır ki, doğandan sonra aydan kəc olmayaraq höyürə gələrək cütləşib və döllənərək yüksək yaşamaq qabiliyyətinə malik olan balalar versinlər.

Geniş heyvandarlıq təcrübəsinə çoxdan məlumdur ki, bizim respublikamızın rayonlarında yay zamanı bir tərəfdən otlaqlarda (örüşlərdə) otların quruması, o biri tərəfdən havanın çox isti keçməsi nəticəsində həm heyvanların örüş müddəti qısalır, həm də heyvanlar örüş müddətində az və aşağı keyfiyyətli qurumuş (ağaclaşmış) otlarla yemlənirlər. Bundan əlavə, həmin heyvanların istirahəti və rahatlığı pozulur. Hələ bir çox aran rayonlarının təsərrüfatında heyvanlar bu isti yay aylarında gündüz 11 radələrində möhkəm isti düşdükdən sonra suvarılmağa gətirilir, suvarılır və oradaca sərin külək əsənə kimi (saat 16-ya kimi) günəşin isti şüaları altında yatızdırılır. Heyvanların narahatlığı və fizioloji vəziyyətinin pozulması yuxarıda göstərilən səbəblərlə qurtarmır, bundan əlavə olaraq göydeyin, hünülər və ağcaqanadlar heyvanların rahatlığını pozur və qanlarını sorurlar. Bu səbəblərə görə yay zamanı heyvanlar süd verir məhsuldarlığını olduqca azaldırlar, yaz aylarında nisbətən 50%-ə kimi arıqlayırlar. Xəstəliyə tez tutula bilirlər və nəhayət, doğduqdan uzun müddət sonra höyürə gəlirlər, amma höyürə gələn heyvanların çoxu isə döllənməyərək qısır qalır.

**Havanın istiliyindən asılı olaraq heyvanların fizioloji vəziyyətinin dəyişməsi**

| Havanın istiliyi orta hesabla kölgədə | | Tənəffüsü (1 dəqiqədə) | | | Nəbzi (1 dəqiqədə) | | Bədəninin hərarəti (dərəcə) | |
|---|---|---|---|---|---|---|---|---|
| 1. | Yaz 6,7-17,6⁰ | Camışlarda<br>İnəklərdə | 18<br>18 | 12-34<br>12-36 | 68<br>67 | 53-67<br>54-72 | 38,6<br>38,7 | 38,4-39,4<br>38,1-38,9 |
| 2. | Yay 22,4-37⁰ | Camışlarda<br>İnəklərdə | 32<br>37 | 24-90<br>30-50 | 80<br>71 | 77-82<br>53-78 | 39,7<br>39 | 39,1-40,1<br>38,5-39,7 |

Cədvəldə göstərilən rəqəmlərdən aydın etmək olur ki, yay zamanı heyvanların tənəffüsü, nəbzi artır və bədəninin hərarəti yüksəlir. Bunlar da heyvanların fizioloji vəziyyətinin göstəricilərinin normadan yüksək (anormal) olmasını göstərir.

Təcrübələrmiz göstərmişdir ki, əgər yaz aylarında inək və camışların köklük dərəcəsi, ümumən ortadan yüksək olursa, amma, yay aylarında isə həmin heyvanların köklük dərəcəsi ortadan aşağı düşür. Əgər yaz aylarında doğmuş inək və camışlar bir aydan gec olmayaraq höyürə gəlib mayalanarsa, yay aylarında doğan heyvanların çoxu isə 3-4 ay və daha çox müddət höyürə gəlməyərək qısır qalırlar. Bunların qarşısın almaqdan ötrü bizim işləyib hazırladığımız metodlara əsaslanaraq heyvanların çimizdiriliərək yay düşərgə şəraitinə keçirilib düzgün yemləmə və bəsləmə şəraitində saxlanılmasını təklif etdik.

Elmi nailiyyətlər və qabaqcıl heyvandarların iş təcrübəsi göstərir ki, heyvanları yay düşərgə şəraitində və onları düzgün zootexniki qanun üzrə yemləyib bəslədikdə onların məhsuldarlığı bir neçə dəfə yüksəlir və qısrlıq aradan qaldırılaraq hər 100 inək və camışdan ildə 100-107 sağlam və yüksək məhsuldar bala əldə etmək olur. 1954-cü ilin yay aylarında Xıllı (Neftçala) rayonunun Stalin adına kolxozunun sağıcısı Mirzadə Həziyevanın ixtiyarında olan 8 baş sağdığı inəklər yay düşərgə şəraitində keçirilməmişdən qabaq pis yemləmə şəraitində bəslənmişdilər. (Yalnız az məhsuldarlı qurumuş otlaqlarda otarılmışdır)

Bununla əlaqədar olaraq havanın istiliyinin təsirindən heyvanların otarılma müddəti qısaldığı üçün onlar gündüz saat 11-dən 16-ya kimi günəşin isti şüaları altında qalaraq yemlənməyərək yatışırdılar. Belə pis şəraitdə yemlənib və bəslənilmiş 8 baş inəkdən 5 başı doğandan 5 ay sonra belə höyürə gəlməmiş və cütləşməmiş qalaraq qısır olmuşlar. Bu 8 baş inəklər hər gün cəmi orta hesabla 11,2, yəni hər baş inək 1,4 kq süd vermişdir. Həmin inəklər iyul ayında yay düşərgə şəraitinə keçirildikdən sonra onalırn yeməlməə və bəsləmə şəraiti yaxşılaşdırılmışdır. Heyvanlar saat 9-dan 18-ə kimi talvar altında saxlanılaraq, yaşıl, tərkibində çoxlu vitamin olan yemlərlə əlavə olaraq bir kq jmıx və 1 kq arpa unu ilə yemləndirilmişlər. Qalan vaxtları isə, yəni saat 19-da səhər saat 9-a kimi otlaqlarda otarılmışlar. (sağım, suvarma və istirahət vaxtlarını çıxmaq şərti ilə). Belə üsul heyvanların fizioloji vəziyyətlərinin daim

normal olmasını, onların düzgün zootexniki qaydalara uyğun olaraq yemlənib və bəslənməsini və eləcə də təbii otlaqlardan düzgün istifadə edilməsini təmin etmişdir.

Yay düşərgə şəraitinə keçirilmiş bu 8 baş inəkdən qısır qalmış 8 baş inək 6-7 gün ərzində höyürə gələrək gütləşdirilib döllənmişdir. (Boğaz olmuşlar) Həmin inəklərin yemləmə və bəsləmə şəraiti yaxşılaşdığı üçün onlrın süd məhsuldarlığı və köklük dərəcəsi də yüksəlmişdir. İnəklərin qurutma dövrünün yaxınlaşmasına baxmayaraq (laktasiyanın 6-7-ci ayları) inəklər yay düşərgə şəraitinə keçirildikdən sonra 1 həftə ərzində öz süd məhsuldarılığını 2 dəfədən artıq qaldırmışdır. Orta hesabla 1 inəyin 1 gündə verdiyi südün miqdarı 3 dəfəyə yaxın artaraq 3,7 kq-a çatdırılmışdır. Qaşqa və Qarağız adlı inəklər isə öz südlərini 1,8-2,2 kq-da yay düşərgə şəraitinə keçirildikdən sonra 8,1-9 kq-a qaldırmışlar. (4 dəfə)

Eyni nəticə Qırmızıkəndin Voroşilov adına kolxozunda da alınmışdır. Bu kolxozda yay düşərgə şəraitinə keçirilmiş 11 baş inək öz südlərini 2,5 dəfə artımışlar və bütün inəklər vaxtlı-vaxtında cütləşdirilib döllənmişlər. Xolqarabucaq kəndinin heyvandarları 1955-ci ildə 40 baş sağmal inəkləri yay düşərgə şəraitinə keçirərək onların məhsuldarlığını yüksəltməyə nail olmuşlar. Yay düşərgə şəraitinə keçirilmiş inəklər vaxtlı-vaxtında (25 gündən gec olmayaraq höyürə gələrək mayalandırılıb və döllənirlər). Həmin heyvanlar öz süd məhsuldarlığını artırmaqla (3-4 dəfə) bərabər normal fizioloji vəziyyətini saxlayıb və kökəlmişlər. Əksinə olaraq yay düşərgə şəraitinə keçirilməyən heyvanlar isə günü-gündən öz süd məhsuldarlığını azaldır, arıqlayır, uzun müddət isə höyürə gəlməyərək qısır qalırlar. Yay düşərgə şəraitinə keçirilmiş 40 baş inəkdən indi (1955-ci il iyun ayında) hər gün 210-215 kq süd sağılır. (Hər hesabla hər inəkdən 5,3 kq) (hər balaya əmizdirildikdləri 3-4 litr süddən başqa) yay düşərgə şəraitinə keçirilməmiş 84 baş sağmal inəklərdə isə 1 gündə cəmi 251 kq süd sağılır. Hər bir baş inək orta hesabla 3 kq süd vermişdir. Yəni yay düşərgə şəraitinə keçirilmiş hər bir baş inəklərə nisbətən az süd vermişlər.

Heyvandarların çoxu yay düşərgə şəraitini birtərəfli başa düşərək elə hesab edirlçər ki, guya yay düşərgə şəraitinə keçirilmiş heyvanlar tamamilə otlaqlardan məhrum olunur, yalnız tövlədə yemləndirilməlidirlər. Əlbəttə bu fikir tamamilə düzgün deyil, yanlışdır. Yay düşərgə şəraiti bizim respublikamızın aran rayonlarında elə qurulmalıdır ki, heyanlar əsas etibarilə saat 11-dən 16-yadək isti günəş şüaları altında ac-acına yatışdırılmasın və gögöyün, hünü, ağcaqanadlar tərəfindən narahat edilərək qanlarının sorulması əvəzinə sərin talvar altında saxlanılaraq əlavə yemlərlə yemləndirilsinlər. Belə bir üsul bizim tərəfimizdən Neftçala rayonunun Xolqarabucaq kəndində Stalin, sonralar N.Nərimanov adına kolxozun maldarlıq fermasında tətbiq edilərək hərtərəfli yoxlanılmışdır. Yay düşərgə şəraitinə keçirilmiş inəklərin otarılması, sağılması və suvarılması o biri yay düşərgə şəraitinə keçirilməyən heyvanlarla birgə olduğu üçün heç bir əlavə əmək və xərc sərf olunmur. Yay düşərgə şəraitinə keçirilən və keçirilməyən heyvanların fərqi yalnız orasndadır

ki, yay düşərgə şəraitinə keçirilən inəklər suvarıldıqdan sonra, naxırçı və sağıcılar tərəfindən talvar altına gətirilir və qabaqcadan hər baş heyvan üçün hazırlanmış əlavə yemlə (0,5 kq jmıx, 0,5 kq arpa yarması, 2 kq quru ot və qamış (3-5 kq) yemləndirilir. Qalan vaxtlarda isə axşamçağı, səhər və axşamlar hava sərin olan zaman o biri heyvanlarla birgə otarılır. Belə bir üsul təbii örüşlərin səmərəli istifadə olunmasını, heyvanların məhsuldarlığının artmasını, heyvanların fizioloji vəziyyətlərinin normal qalmasını təmin edərək kolxozun bu işə az xərc çəkib böyük gəlir əldə etməsini təmin edir.

Geniş heyvandarlıq təcrübəsinə çoxdan məlumdur ki, hər hansı səbəbdənsə balasız sağılan inək və camışlar balasını əmizdirib sağılanlardan tez höyürə gəlir, cütləşib və döllənirlər. N.Nərimanov adına kolxozda aparılan təcrübələr zamanı 6 baş camış doğulduqdan sonra balasız sağılırdılar. Həmin camışlar doğandan 14-16 gün sonra höyürə gəlib cütləşib və boğaz olmuşlar. 42 baş camış balasını əmizdirib sağılan camışlardın isə 20 başı doğduqdan sonra 5-9 ay sonra cütəlşəməyərək qısır qaldılar. Qalan 22 baş camış isə doğduqdan sonra 18 gündən tez olmayaraq höyürə gələrək cütləşdirilib döllənmişdir.

Belə faktlara biz inək və qoyunlarda da rast gəlmişik. Ana heyvanlar balalı sağılıdqda onlarda balaya qarşı analıq refleksii əmələ gəlir və güclənir. Ana heyvanların içərisində balaya qarşı olan analıq refleksinin gücü ayrı-ayrı heyanlarda başqadır. O ana heyvanlar ki, analıq refleksii çox yüksək inkişaf edir həmin heyvanlar ayrı ana heyvanlara nisbətən (hansılarının ki, analıq refleksi zəif inkşaf edir) gec höyürə gəlir, cütləşir və döllənir. Buradan da nəticəyə gəlmək olar analıq refleksi nə qədər güclü inkişaf etsə bir o qədər də tənasül refleksi (heyvanların höyürə gəlmə refleksi) zəif inkişaf edir və heyvanların çoxu uzun müddət höyürə gəlməyərək qısır qalırlar. Odur ki, bütün kolxoz fermalarında inək və camışlar doğduqdan sonra, onların balalarını ayırıb, dayə üsulu ilə başqa heyvanlara və yaxud yüksək mədəni üsulla bəsləmə şəraiti olan, əl ilə süd içirmək üsulundan istifadə etsələr heyvan doğduqdan sonra onların cütləşmə, döllənmə və qısırlıqla mübarizə işlərini yüksək dərəcədə yaxşılaşdıra bilərlər. Çünki balanın anadan ayrılması və ananın balasız sağılması ananın balaya qarşı refleksinin sönməsinə, tənasül refleksinin isə güclənməsinə (höyürə gəlmə refleksinə) səbəb olur. Belə heyvanlar doğduqdan sonra həm çox süd verirlər, həm də balalar əmizdirilmədiyi üçün süd təmiz sağılır, həm də tez höyürə gələrək döllənib boğaz olurlar. Həm də sağılan süddə yağın faizi yüksəlir, çünki buzov və bala əsas etibarilə elində sağımın axırında qalmış (saxlanılmış) südü əmir ki, bu südün də yağ faizi əvvəlki sağılan südə nisbətən yağlılıq faizi yüksək olur, balalar isə düzgün zootexniki qaydalarla yemləndirilirlər. Dayə üsulu - dayə ana heyvanın altında başqa analardan doğandan sonra ayrılmış dörd körpə balanın əmizdirilməsi, saxlanılması bəslənilməsi deməkdir. N.Nərimanov adına kolxozun femasında bizim göstərişimiz üzrə buzovların doğulduqdan sonra

ayrılıb day əvə əllə süd içirmə üsuluna keçirilməsi işi əşkil edildi. Bu işin düzgün təşkil edilməsində və aparılmasında Rusiyada təcrübə keçmiş sağıcı Yadigar Həsənov xüsusilə seçilir. O, inək doğan kimi buzovu inəkdən ayırır və inəyi sağaraq buzovu həmin saat sağdığı ağız ilə yemləyir (ağızlandırır). Həmin inəklər gündə 3 dəfə sağılırlar, sağından sonra buzovların bizim tərtib etdiyimiz yem cədvəli əsasında yemləyirlər. N.Nərimanov adına kolxozda apardığımız üç illik təcrübələrin nəticəsi göstərmişdir ki, törədici buğalar əsas etibarilə qüvvəli yemlərlə yemləndikdə və dişi heyvanlar isə çoxlu (tələb olunan qədər), tərkibində çoxlu vitamin olan yaşıl yemlərlə yemləndikdə onların yemlərə olan fizioloji tələbatı ödənilir, analar tez höyürə gələrək mayalanan zaman döllənmə faizi çox yüksək olur və alınan balalar isə yüksək yaşamaq qabiliyyətinə malik olurlar. (Yüksək diri çəkili, tez artan, xəstəliklərə qarşı davamlı olurlar).

Birinci sinif təcrübə heyvanları olan 29 baş camışa və iki baş törədici kələ biz yalnız yaşıl yem verirdik. Bu heyvanları cütləşdirdikdə 29 baş xamışdan yalnız birinci həvəs dövründə 12 başı, 42% boğaz olmuşdur. Amma qalanları isə 2,3 və 4-cü həvəs dövrlərində təkrarən mayalanaraq döllənmişlər (boğaz olmuşlar). Amma ikinci sinifə daxil olan camış və törədici kəllər isə bir-birindən fərqli olan yemlərlə yemləndirildikdə tamamilə başqa, çox gözəl nəticələr əldə edilmişdir. 34 baş camış hamısı birinci sinifdən olan camışlarla birlikdə yemlənib bəslənilmişdir. Yəni yaşıl, tərkibində çoxlu vitamin olan yemlərlə yemlənmişlər. Amma iki baş törədici kəllər isə o birilərindən fərqli olaraq, əlavə iki kiloqram arpa unu, iki kiloqram jmıx, beş kiloqram yüksək keyfiyyətli yonca otu və yaxud 10-15 kiloqram təzə biçilmiş yaşıl ot, 12-15 kiloqram üzsüz süd ilə yemləndirilmişdir. (Belə yemlərin törədici kəllər üçün bütün kolxozlarda təşkil etmək mümkündür) Belə yaxşı yemləmə nəticəsində törədici buğalar orta hesabla 3-5 millilitr olduqca yüksək keyfiyyətli sperma (toxum) vermişlər. Belə keyfiyyətli sperma ilə mayalanan 34 baş camışdan 28 başı (32%-i) birinci həvəs dövründə boğaz olmuşlar və yüksək yaşama qabiliyyətinə malik olan balalar vermişlər. Qalan 6 baş camış isə (18%) o biri ikinci və üçüncü həvəs dövrlərində mayalandırılaraq döllənmişlər (boğaz olmuşlar).

Əgər birinci sinifdə camışlardan alınan balaların anadan olan zaman çəkisi orta hesabla 25-34 kiloqram oldusa, ikinci sinif camışlardan alınan balaların diri çəkisi isə 35-38 kiloqram, yəni 4-10 kiloqram artıq olmuşdur.

Beləliklə, təcrübələrin nəticəsində belə qərara gəlmək olar ki, cütləşmə dövrünə bir ay, ay yarım qalmış törədiciləri qüvvəli və heyvani yemlərlə və eləcə də az miqdarda tərkibində çoxlu vitamin olan yaşıl yemlərlə yemlədikdə onlarla mayalandırılan heyvanların döllənmə faizini yüksəltmək və çoxlu miqdarda yüksək yaşama qabiliyyətinə malik olan balalar almaq olar. Çünki belə yemləmə nəticəsində onların verdiyi spermanın keyfiyyəti kəmiyyəti çox yüksəlir və belə sperma ilə mayalanan heyvanların balaları sağlam, ağır diri çəkiyə və yüksək yaşama qabiliyyətinə malik olurlar. Ona görə də Xolqarabucaq kəndnin heyvandarları bu üsulu geniş tətbiq edirlər.

Heyvanların tezliklə törəyib artmasında və onların cinsi keyfiyyətini tez bir zamanda yaxşılaşdırılması işində ən başlıca amillərdən biri də onların süni mayalanmasının düzgün və geniş surətdə təşkil olunmasıdır.

Xolqarabucaq kəndində apardığımız təcrübələr göstərdi ki, camışlıqda süni mayalanma başqa kənd təsərrüfatı heyvanlarında olduğu kimi çox yaxşı nəticələr verir. Ona görə də camışçılıqda süni mayalanma o biri kənd təsərrüfatı heyvanlarında da olduğu kimi geniş tətbiq olunmalıdır. Əgər 37 süni mayalanmış camışdan birinci həvəs dövrü 34 başı (87 faiz) boğaz olmuşsa və yüksək yaşama qabiliyyətinə malik sağlam və ağır diri çəkili balalar vermirsə, sərbəst cütləşmə zamanı isə 34 baş mayalanmış camışdan birinci həvəs dövründə yalnız 14 başı 40 faiz dölləşmişdir (boğaz olmuşdur) və bunlardan alınan balalar isə nisbətən zəif və diri çəkisi az olmuşdur. Odur ki, süni mayalanma üsulu, heyvandarlığın tezliklə yaxşılaşdırılması, yüksək məhsuldar törədicilərdən daha çox bala almasına heyvanların qısırlığı ilə mübarizə işinin daha yaxşı təşkil edilməsi, çoxlu yüksək yaşama qabiliyyətinə malik olan balaların alınması, heyvanlar arasında tənasül orqanlarının xəstəliyinin yayılmasının qarşısının alınması və nəhayət fermalarda zootexniki hesabatının daha düzgün təşkil edilmə üsulu kimi, təsərrüfatların heyvandarlıq fermalarında geniş tətbiq olunmalıdır.

# AZƏRBAYCANDA SÜDLÜK MALDARLIĞIN İNKİŞAFI

**Ə.B.BƏŞİROV**, *Azərbaycan Heyvandarlar Assosasiyasının prezidenti, Rusiya Beynəlxalq Keyfiyyət Problemləri Akademiyasının həqiqi üzvü, akademik.*

Heyvandarlığın başlıca sahəsi olan südlük-ətlik maldarlıq axırıncı 10 il ərzində yüksək sürətlə inkişaf edir. Bunu demək kifayətdir ki, əgər 1969-cu ildə respublikamızın heyvandarlıq təsərrüfatlarında hər inək və camışdan 700 kq yaxın süd sağılırdısa, ancaq 1978-ci ildə 1548 kq süd sağılmışdır. Belə bir inkişafa respublika rəhbəliyinin bir sıra mühüm dövlət əhəmiyyətinə malik olan tədbirlərin həyata keçirilməsi nəticəsində mümkün olmuşdur. Bu hər şeydən əvvəl südlük heyvandarlığın maddi-texniki bazasının möhkəmləndirilməsi, bu sahədə çalışan bütün təsərrüfatlarda çalışan zəhmətkeşlərin məhsul istehsalının artırılmasında və dövlətə satılmasında maddi marağın yüksəldilməsi nəticəsində mümkün olmuşdur.

Bu sahədə aşağı diri çəkiyə və məhsuldarlığa malik mal-qaranın cinsinin yaxşılaşdırılması, cins mal-qaranın sayının artırılması və yem bazasının təsirli dərəcədə mhkəmləndirilməsi də böyük rol oynamışdır.

Bununla bərabər qeyd etmək lazımdır ki, hələ indii də respublikamızda süd istehsalını artırmaq üçün böyük ehtiyat mənbələri labüddür.

Bu barədə o dövrdə respublikamıza rəhbərlik etmiş, ümummilli liderimiz 1978-ci ildə H.Ə.Əliyev 1978-ci ildə Sov. İKP MK-nin plenumunun yekunlarına həsr edilmiş Azərbaycan KP MK-nın iyul plenumunda söylədiyi nitqində deyir:

Südçülük maldarlığın inkişaf etməsinə baxmayaraq bu sahədə əmək istehsalının yüksəldilməsi, istehsal olunan südün dəyər qiymətinin endirilməsi (azaldılması) sağılan südün keyfiyyətinin yüksəldilməsi, süddə yağın və zülalın miqdarının yüksəldilməsi, bioloji cəhətdən qidalılığının və orqanizmə verdiyi xeyir təsirinin yüksəldilməsi kimi istifadə edilməyən imkanlar və ehtiyat mənbələri vardır.

Bunun üçün hal-hazırda texnika və yüksək məhsuldar cins mal-qara və möhkəm yem bazası ilə təmin edilmiş, yeni böyük südçülük komplekslərinin yaranması geniş imkanlar açır.

Lakin hələ də komplekslərin və təsərrüfatların çoxu gəlirlə işləmirlər. Bunun da əsas səbəbi axırıncı illər yemə, əməyə və istismara çəkilən xərclərin xeyli artması, heyvanların artıb törəməsinin səviyyəsinin aşağı olması və i.a. ilə izah etmək olar. Belə ki, hər il 100 inək və camışdan respublika üzrə orta hesabla 60-70 baladan artıq, hər 100 qoyundan 60-80 quzudan artıq alınmaması təsərrüfatlara ilbə-il milyonlarla ziyan vurur, alınan məhsulun dəyər qiymətini artırır.

Bu sahədə naxırda məhsul verən heyvanların sayının az olması da alınan məhsuluÎn dəyər qiymətinin yüksəlməsinə böyük təsir göstərir.

Naxırda inək və camışların sayı hal-hazırda 26% hər 100 inək və camışdan hər ildə 60-70 baladan artıq alınmaması bu sahədə də böyük imkanların və ehtiyat mənbələrinin olmasını göstərir.

İndi ölkəmizin və respublikamızın alimləri tərəfindən yem bazasının möhkəmləndirilməsi, yemləmənin yaxşılaşdırılması səmərəli artıb törəmə sistemləri işləib hazırlanmışdır ki, bunların heyvandarlıqda qabaqcıl təcrübə üsullarını tezliklə və geniş miqyasda respublikamızın heyvandarlıq təsərrüfatlarında və fermalarında yayılması heyvandarlığını, məhsuldarlığını daha da sürətlə artması və alınan məhsulun dəyəri qiymətinin azalmasına, südlük maldarlığın ən gəlirli sahəyə çevrilməsinə səbəb olar.

Heyvandarlığın hal-hazırda inkişaf dövrü (intensivliyi) daha səmərəli sənaye metodlarına əsaslanan yeni prespektiv texnoloji proseslərin məhsul itehsalında geniş tətbiqi ilə xarakterikdir.

Söhbət respublikamızın heyvandarlığının gələcəyindən gedir, onun perspektiv inkişafından gedir. Bunun üçün indiki komplekslərin iş təcrübəsini dərindən öyrənib izah etmək, qabaqcıl təcrübənin nəticələrini cəmləşdirib, yaymaq geniş miqyasda texnologiyanın daha da təkmilləşdirilməsinə yönəldilmiş geniş miqyasda tədqiqat işləri aparmaq qarşıda duran ən mühüm vəzifələrdəndir.

Qabaqcıl texnologiyanın tətbiqi üçün ən mühüm şərtlərdən biri də böyük təsərrüfatların çoxunun eyni istehsal üçün ixtisaslaşmasıdır.

İndii axırıncı illər bu sahədə ölkəmiz və həm də respublikamız miqyasında böyük irəliləyişlər var.

Doğrudur, bu sahədə irəliləyiş bütün inkişaf etmiş heyvandarlıq ölkələrində də gedir. Lakin, inkişaf sürətinə, intensivliyə görə on beş respublika arasına bizim respublika birinci yerdədir (1979-cu il).

Hər fermada inəklərin orta sayına görə bizim ölkəmiz dünyada birinci yeri tutur.

Ölkəmizdə olan heyvandarlıq təsərrüfatlarının fermalarının 60-70%-dən çoxunda 300 başdan çox və 30-35%-dən çoxunda isə 500 başdan çox inək saxlanılır və südlük üçün istifadə edilir. İnəklərin fermalarda sayının çox olması səmərəli istehsal, bütün texnoloji proseslərinin mexanikləşdirilməsi, avtomatlaşdırılması və heyvandarlıq təsərrüfat və komplekslərinin gəlirli işləməsi üçün imkan yaradır.

İndi 400-dən 1200-ə qədər və daha çox inək və camış tutan südlük komplekslərin tikilməsi və yaradılması üçün imkanlar vardır. Hal-hazırda uğurla fəaliyyət göstərən böyük komplekslərin iş təcrübəsi yuxarıda göstərilənləri bir daha sübut edir.

Burada seleksiya və damazlıq işlərinin təşkili və aparılması üçün də böyük imkanlar yaranmışdır.

Bir sözlə, yeni texnologiya əsasında təşkil edilmiş bu böyük heyvandarlıq kompleksləri hər bir sahədə qarşıda tələblər qoyduğu kimi seleksiya və damazlıq işlərinin təşkili və aparılmasına da yeni tələblər qoyur.

**Heyvandarlığın sənayeləşdirilməsinin bioloji əsasları**
**Cins və texnologiya**

Biz ölkədə cinsin düzgün seçilməsinə və istifadəsinə böyük əhəmiyyət veririk. Akademik LöK. Ernestin və İ.İ. Çijovun Ümumittifaq Heyvandarlıq İnstitutunda apardığı təcrübələr sübut etmişdir ki, heyvanların məhsuldarlıq keyfiyyəti yemləmə və bəsləmə şəratindən asılı olaraq dəyişə bilər. Ona görədə yemləmə və bəsləmə heyvandarlıqda elmi əsas da təşkil edilməlidir.

Akademik LöK. Ernestin rəhbərliyi ilə Rusiyada onun ayrı-ayrı iqtisadi və təbii şəraitlərə mənsub olan rayonlar və təsərrüfatlarından, bütün kateqoriyadan olan təsərrüfatlarda aparılmış bonitrələrin nəticələri, damazlıq zavodlarının illik hesabatları elektron hesablayıcı maşınlarında müşahidə edilmiş, yekunlaşdırılmış və qiymətləndirilmişdir.

Bu proqressiv tədbirin gələcəkdə respublikamızda, damazlıq heyvandarlıqda da tətbiq olunması vacibdir.

Rusiyanın 10 zonası üzrə:

Mal-qaranın ayrı-ayrı cinslərinin süd məhsuldarlığına görə qiymətləndirilməsi göstərdi ki, qara ala cins ən yüksək süd məhsulu verən cinslərdən biridir. Bu cins il boyu hər inəyə ildə 25-30 sentner və ya düşdükdə qra ala cins daha yüksək fayda verir. Bu cinsdən olan hər inək ölkə üzrə orta hesabla 2500-3000 kq süd verir.

İntensiv yemləmə şəratində qara-ala cisindən olan inəklərin süd məhsuldarlığı daha çox artır. Amma qeyd etmək lazımdır ki, hər yerdə (Ural zonasından başqa) qara-ala cinsdən olan inəklərin südündə yağın və quru maddənin miqdarı o biri cinslərə nisbətən xeyli azdır. Ona görə də bu sahədə cinslər içərisində ən axırıncı yeri tutur.

Qara ala cinsdən olan inəklərlə yanaşı, intensiv yemləmə şəraitində Kostroma cinsləri də süd məhsuldarlığını yüksəltmə xüsusiyyətinə malikdir.

Ancaq aşağı səviyyəli yemləndirmə şəraitində qara-ala cinsdən olan inəklər öz süd məhsuldarılğını kəskin surətdə azaldır və hətta o biri cinsdən olan inəklərdən də az süd verir. Bu da onun yemləməyə olan yüksək təlabatını göstərir. Misal üçün mərkəzi qaratorpaq zonalarda inkələrin yemlənməsi orta səviyyədə olduqda, onların yem paylarında saman və bəlimin miqdarı çox olanda simmetal cinsindən olan inəklərin südündən yağ çıxarı o birilərə nisbətən daha çox olur. Nəinki o biri cinsdən olan inəklərdə.

Misal üçün, Rusiyanın cənub rayonlarında və Volqaboyu rayonlarda ən çox süd verən cinslərdən şvis və simmentol cinslərini göstərmək olan. Ancaq Şimali Qafqaz şəraitində isəŞvis və Qırmızı səhra cinslərindən olan inəklər ən çox süd verirlər.

Süd məhsuldarlığına görə Yaroslav, Qırmızı Qorbat, Kurqan cinsləri ən axırıncı yerləri tutmasına baxmayaraq südündə yağın və quru maddənin miqdarına görə onlar birinci yeri tutur.

Pendir hasilinə görə ayrı-ayrı cinslər bir-birindən xeyli fərqlənirlər.

Belə ki, 1 kq pendir hasil etmək tələb olunan südün miqdarı qonur Latviya inəklərinin 9,5 kq simmental inəkləri üçün 12 və 12,6 kq süd tələb olunur.

Şit yağ hasil etmək üçün əsasən (97-98%) simmental, qara-ala, Yaroslav və Qırmızı Qarbat cinslərinin inəklərinin südü istfadə edilir. Cinsləri qiymətləndirmək üçün ən vacib göstəricilərdən biri də alınan məhsulun hər şərti vahidinə sərf olunan yemin miqdarı, süddə yağın və quru maddənin miqdarıdır. Cinslərin yoxlanmadan keçirilməsi sahəsində aparılan İ.Çinarovun təcrübələri göstərdi ki, yem məsrəfi bütün cinsləri həm südlük və həm də ətlik / verdikləri süd məhsuldarlığına görə və diri çəkisinə görə / hesab edilsə də normadan xeyli çox olur. Maksimum 15-18%.

Cavanların inkişafına görə, düyələrin ən yüksək çəkiyə /analarının çəkisinə görə/ malik olması qara-ala, simmental və şvis cinsləri oldu. Onların düyələrinin, diri çəkisi, analarının diri çəkisinin 12 aylıqda 48%-ni, 18 aylığında isə 59%-ni təşkil etmişdir. Ancaq Kostroma və yaroslav cinslərindən olan düyələrinki isə müvafiq olaraq 39-40% və 51-53% olmuşdur.

Düyələrin mayalanma yaşı əsasən onların inkişafından, məhsuldarlıq istiqamətindən asılı olaraq dəyişir. Qara ala və Xolmoqor cinslərinin düyələri simmental və şvis cinsinə nisbətən xeyli tez yetişkəndirlər.

20 aylıqda qara ala cinsdəki olan düyələrin 42,3% Xolmoqar düyələri 52%, amma simmental və Şvis cinsindin olan düyələrin yalnız 21-32% mayalanıb döllənmişdir. Yaroslav cinsindən olan düyələr əsasən gec yetişkəndir. Onlar əsasən 24 aylıqdan sonra mayalanıb döllənirlər (70% çoxu).

Akademik L.K. Ernestin apardığı təcrübələr göstərişdir ki, üzlü süd və yağ hasil etmək üçün iqtisadi cəhətdən ən əlverişli qara-ala cinsindən olan inəklərin istifadə edilməsidir.

Qara ala cinsindən olan inəklər qonur Latviya və qara-ala cinsinə nisbətən 8-12% südü və 10-12% yağı artıq verdiyi üçün daha əlverişli hesab edilir. Bu zonada pendir hasil etmək üçün qonur latviya cinsindən olan inəklərin istfadəsi 1,5-2,0 dəfə o biri cinslərdən səmərəlidir.

Bir çox rayonlarda yüksək süd məhsuldarlığına mənsub olan cins inəklərin miqdarı artır. Ancaq bir çox rayonlarda hələ də çoxlu süd məhsuluna mənsub olan heyvanlar qalır. Bununla bərabər yüksək süd məhsulu verən Kostroma cinsindən olan inəklər hələ də geniş yayılır.

Bizim respublikamıza gəldikdə isə camış və rebu ilə yanaşı yüksək süd məhsulu verə bilən inəklərin sayının artırılması üçün bütün ikanlar, nəzərə alınaraq lazımi tədbirlərin həyata keçirilməsi vacibdir.

Böyük mexanikləşdirilmiş ferma və komplekslərin səmərəliliyini yüksəltmək məqsədilə, kompleksləri 3000-3500 kq və daha yüksək süd məhsuluna malik olan ilk növbədə camış və inəklərlə komplektləşdirilməlidir. Əgər bundan az olsa onda komplekslər gəlirlə işləyə bilməz. Yuxarıda qeyd edilənlərdən göründüyü kimi komplekslər üçün cins seçilməsi vacib əhəmiyyət kəsb edir. Ona görə ki, cinslərin çoxunun potensial məhsuldarlığı yüksək deyildir.

Komplekslərə seçilən cinsin potensial məhsuldarlığı yüksək olmalıdır. Bununla bərabər onlar yeni texnologiyanın tələbinə cavab verməlidir.

/Elektrik, mexanik sağım, süni mayalanma və i.a/. Bu məsələnin həlli üçün iki əsas şərtə riayət olunmalıdır. Birinci, yüksək potensial məhsuldarlığa malik olan cinsin seçilməsi və ikinci də təsərrüfatların imkan və şəraitlərinin nəzərə alınmasıdır.

Südlük komplekslərdə istifadə etmək üçün ən çox uyğun gələn və iqtisadi cəhətcə səmərə verə bilən cinslər südlük cinslərdən olan camış (yağlı və qatı süd verən) inəklərdir. Birinci növbədə Azərbaycan və Mürrəh camış cinsləri və hibridləri qara-ala, (holland və qolştinfrir), Qırmızı səhra, Qonur latviya kombinə cinslərdən isə şvis və simmental və onların südlük tipləri uyğun gəlir. Gələcəkdə cinslərin komplekslər şəraitində yetişdirilən cinslərin südlük istiqamətində seleksiya aparılmalıdır.

Sənayeləşmənin əsas şərtlərindən biri də daima bütün cinslərin məhsuldarlığının genetik potensialının yüksəldilməsidir. Bunun üçün elmi-tədqiqat institutları çoxlu metodlar işləyib hazırlamışlar. Bunların ən əsası elit və rekordbuğa və kəllərin toxumunun dondurularaq qenobankda saxlanılması və süni mayalamada geniş miqyasda istifadə edilməsidir.

# DÜNYA MALDARLIĞIN İNKİŞAF TEMPİ VƏ AZƏRBAYCAN MALDARLIĞININ ƏSASLARI

**Suliddin ABBASOV**, *k/t.e.n.dosent, Asərbaycan Dovlət Aqrar Universiteti*
**İlahəxanım MƏMMƏDZADƏ**, *disertant, Azərbaycan Dövlət Aqrar Universiteti*

Aqrar sənayenin inkişaf etdirilməsində əsas məqsəd heyvandarlıq məhsulların (ət, süd, dəri və başqa məhsullar ) artırılması problemidir.

Son illərdə bir çox növ heyvanların ət məhsuldarlığı strukturu əsaslı dəyişmişdir. 1985-ci ildən 2009-cu ilə kimi dünyada istehsal olunan bütün növ ət 151,2 milyon tondan 220,5 milyon tona qədər yəni 45% (bundan quş əti-88%, donuz əti - 42%, qoyun və keçi-32% və qaramal-20%) artmışdır.

Əhalinin hər adam başına düşən ət il ərzində 00,7 kq-dan 37 kq-a yüksəlmişdir, ancaq süd istehsalı bir neçə dəfə azalmışdır.

Heyvandarlığın əsası olan maldarlığın struktur dəyişməsi gələcəkdə inkişaf tempinə təsir göstərəcəkdir.

Son 20 ildə heyvandarlıq sahəsində aparılan düzgün seçmə taylaşdırma,seleksiya-genetika,texnoloji komplekslərin təşkili və iqtisadi tədbirlərin aparılması nəticəsində ət və süd məhsulları yüksəldilməsi bir çox ölkələrdə əhəmiyyətli nəticə vermişdir. Bu tədbirlərin ən əsası heyvanların düzgün yemləndirilməsi prinsiplərini həyata keçirilməsi ilə əlaqədardır. Kənd təsərrüfatı heyvanlarının yem payında mineral maddələrinin, proteinin, vitaminlərin və sair komponentlərin olması məhsuldarlığa və düzgün böyümə dinamikasına bilavasitə təsir göstərir.

Dünya maldarlığın inkişaf dinamikası xüsusən yüksək məhsuldar cinslərdən istifadə olunaraq onlarda süni mayalanma və embrionun köçürülməsi işləri geniş aparılır. Ona görədə artıq Brazilya, ABŞ, Kanada, Avztraliya, Almaniya, Fransa kimi dövlətlər embrion satışı üsrə qabaqcıl yerləri tutmuşdur.

Südlük istiqamətli cinslər dünyada ən əsas yerlərdən amerika və kanada seleksiyalı holştin friz cinsi tutur. Bu cinsdən istifadə olunaraq müxtəlif qara-ala cinsin tiplərini və südlük və südlük-ətlik cinslərdə qan qatma üsulunun tədbiqi,xüsusən simmental cinsindən yeni qırmızı ala holştinfriz yaradılması bazası qoyulmuşdur.

Macarıstan respublikasında holştinfriz cinsin kütləvi olaraq simmental cinsi ilə çarapzlaşdırılması yaxşı nəticələr vermişdir.Əgər 1970–ci ildə hər inəldən sağılan süd 3458kq, 1980-ci ildə 4138 kq olmuşdursa artıq bu göstərici 2008-ci ildə 6500 kq yüksək olmuşdur.

1952-ci ildə ABŞ-da südlük cinslərdə qaramalın 46,2% holştin təşkil edirdisə bu rəqəm 90% qaldırılmışdır. Bu isə hər inəkdən sağılan südün 4421 kq-dan 8000kq qaldırılmasına səbəb olmuşdur. Baxmayaraq ki, burada hər inəkdən sağılan süd bəzi abropa və asiya dövlətlərin göstəricilərindən üstündür. Lakin burada hər il təsərrüfatlarda 19% -ə yaxın inəklər leykoz xəstəlik.ərinə tutulduqları üşün çıxdaş olunur. Ona görədə həmin heyvanların təsərrüfatda saxlanması III-laktasiyadan yuxarı artıq istifadə olunmur. Cinsin dözümlüyünü artırmaq məqsədilə son illərdə cerze, herzey cinsləin törədicilərindən istifadə olunması tədbirləri aparılır Eyni zamanda brazilya südlük holland qir törədici buğalarından istifadə olunması tədbiq olunur ki,buda bilavasitə təsərrüfatda uzunmüddətli istifadə olunması işi aparılır.

İlk dövürlərdə Latın Amerikası dövlətlərin qaramalın cins tərkibi buraya gətirilmiş İspaniya və Portuqaliya yerli malları olmuşdur sonralar məhsuldarlığını yüksəltmək və dözümlüyünü artırmaq məqsədilə zebu qanlı heyvanlardan istifadə olunması qərara alınmışdır. Bunada əsas məqsə britaniya mənşəli ətlik hereford cinslərin mühütə uyğunlaşa bilməməsi ilə bağlı olmuşdur.İlk dəfə Hindistandan gətirilmiş (1907-ci ildə 8 baş) Qir, Nelorcinsi yerli Linqxorn cinsi üzərində yaxşılaçdırmaq üçün hibridləşmə tədbiq olunmuşdur. Yüksək seleksiya nəticəsində ətlik tezyetişgən mühütə dözümlü Amerika Bramanı yaradılmışdır.

Amerika Birləşmiş Ştatlarında Braman cinsindən çox geniş və səmərəli istifadə olunaraq ətlik istiqamətində öz xüsusiyyətləri ilə fərqlənən və dünyanın 60 ölkəsində yayılan Santa-hertruda cinsi yaradılmışdır.Yenə hibridləçmə tədbiq olunaraq Bifmaster, brabnqus, simbraun cinslərin yaradılması ətlik cinslərin geniş yayılmasına səbəb olmuşdur.

Dünyanın maldarlığın inkişafına görə xüsusi yeri olan Kanada,Fransa ,Rusiya dövlətlərindədə südlük istiqamətli cins kimi Holştindən törədicilərindən istifadə olunması işləri aparılmışdır. Ona görədə Kanadada 2008-ci ildə hər inəldən sağılan süd 7900kq, Fransada - 5800kq və rusiyada N.İ.Strekozovun (2008) göstəricilərinə əsasən 5757 kq çatmışdır. Lakin bu yüksəlişə baxmayaraq Rusiyada leykoz və ensefalit xəstəliklərin artması südlük istiqamətli Avstraliya və yeni Zelandiya zebu əsaslı hibridlərdən istifadə oloünması nəzərdə tutulmuşdur. Son illərdə Rusiyanın "Sneqri "təsərrüfatında aparılmış hibridləşmə nəticəsində əldə olunan yüksək keyfiyyətli hibridlərin məhsuldarlıq göstəriciləri buna əsas verir. Bu heyvanlar Rusiyada xaricdən gətirilmi.,Holland qara-ala, holştin, qırmızı-Dat ,anqler cinslərindən artıq iqtisadi səmərəliliyə malik olduqları üçün həmin hibridlərin südlük istiqamətdə geniş istifadə olunmasına başlamışlar .Çünki bu heyvanlar möhkəm konstitusiyaya malik olmaqla, brusilyoz, vərəm,leykoz,dabaq kimi xəstəliklər tutlmadıqları üçüç Krosnadar vilayətində böyük hibrid naxırlar yaratmışlar.(A.A.Rubenkov 2008).

Rusiyada 2005-ci ildə ümumi süd istehsalı 9,5 milyon tona çatmışdırsa,bu rəqəm 2009-cu ildə orta hesabla 5% yüksəlmişdir.Ancaq buna baxmayaraq

adam başına düşən süd 229 kq olduğu halda ABŞ-da -267 kq, Fransada-434kq olmuşdur.

12 avropa dövlətlərin ümumi südlük naxırlarınhəcmi 1988-ci ilə nisbətən 2008-ci ilə qədər ki,dövürdə 4077 min baş və ya 17 azalmışdır. Yəni həmin dövlətlərdə südlük naxır 76,1% -dən enərək 63,6% olduğu halda ətlik cinslər 23,9% yüksələrək 36,4% qalxmışdır.Bu ölkələrdə ən yüksək ümumi qaramala görə Niderlandiyada 5.6%, Fransada - 47,7% və İspaniyada - 56,1% olmuşdur. Daniyada ümumimqaramalın həcminin 15,4%-ni ətlik cins təşkil edir. Almaniyada damazlıq 8 ətlik cinsyeti dirilir. Bu zonada ən çox aberdin-anqus, hallovey, Xayland cinslərinin sərbəst və əl ilə mayalanma əsasında aparılır. Bu cinslərin simmental ilə şarpazlaşdırılmasıda aparılır.

Almaniyada ən çox sənaye çarpazlaşdırmadan, xüsusən Limuzin, Şarole, Mavi belqiya cinslərindən istifadə edilir.

Latın Amerikasında yerləşən Brazilya dövlətində 153 milyon başdan şox qaramal vardır ki, hazırda bu malın 128 milyondan çoxu zebunövlü heyvanlardır.Brazilya dövləti yeni zebu və hibrid cinslərin yaradılmasında və zebuçuluq assosiasiyaların təşkili başqa dövlətlərdən fərqlidir. Ona görədə burada naxırlarda 6 aylıq cavanların canlı kütləsi 230-250 kq, 8 aylıqda canlı kütlə 300kq, 12 aylıqda isə 400 kq-a çatırlar.

Hələ 1973-cü ildə Brazilyadan 70,2 min baş yüksək məhsuldar zebu Latın Amerikanın və Afrikanın 18 dövlətinə satılmı.dır.Hindistandan gətirilmiş Qir nelor,quzerat,kankerdj cinslər üzərində yüksək seleksiya damazlıq işləri aparılmış və Brazilyada məşhur cinslər almışlar.

Avstraliya hələ XIX əsrin ortalarında çoxluq təşkil edən ilavar cinsi və avropa mənşəli heyvanlar təşkil edirdi. 1843-cü ildən başlayaraq bura hisə-hisə zebu heyvanlar gətirilirdi və həmin heyvanlar üzrə damazlıq seleksiya işləri aparıldı.Bu ölkə zebular üzərində dərin tədqiqatlar apararaq yeni ətlik və südlük hibrid cinslər yaratmağa başladılar. Əgər 1940-ci illərdə ətlik qaramalın 88% - avropa mənşəli heyvanlar təşkil edirdisə, hazırda 57% avropa mənşəli, 43% zebuqanlı heyvanlardan ibarətdir. Avstraliyada30 ildənçox elmi tədqiqat institute və müəssələri hibridləşmə ilə məşğul olaraq yeni hybrid cinslər yaratmışlar. Ona görədə 100 ildən artıq bir dövürdə istifadə olunan yerli ilavar və avropa mənşəli cinslər hibridlərə nisbətən istiliyədözümlüyü, yüksək böyümə, tezyetişgənlik yemlərdən yaxşı istifadə etmək xüsusiyyətlərinə görə zəif olduqları üçün azaldılmışdır, hibridlərisə mühütə tez uyğunlaşma qabiliyyətinə,tezyetişgənliyinə, qan parazitar xəstəliklərinə dözümlüyünə, qaba yemlərdən yaxşı istifadə etməsinə, törəmə xüsusiyyətinin normal funksiyasına görə avropa mənşəli cinslərdən üstün olduqları üçün Avstraliya alimləri və mütəxəssisləri məhz hybrid cinslər yaradılması qarşıya məqsəd qoymuşlar. Ona görədə qısa müddətdə 4 hibrid cinsi (drafmaster, braford, brandus, mandalonq) yaradılmışdır. Sondövürdə yüksək çəkiyə malik tez yetiçən cins mandalonq öz böyümə xüsusiyyətlərinə görə başqa hybrid cinslərdən

fərqlənirlər. Törədici buğaların canlı kütləsi 1250kq, inəklərin canlı kütləsi orta hesabla 750 kq-a çatırlar. Erkəklər anadan ayrıldıqda 348 kq, 16 aylıqda isə 527 kq və həmin yaşda cəmdək çəkisi 349 kq, kəsim çıxarı isə 66,2% olmuşlar. Ən yaxşı 3 yaşlı buğanın canlı kütləsi 1316kq olmuşdur.

Yeni zelandiya ölkəsində ən geniş yayılmış zebu əsaslı hibrid( holştinfriz Xsahival X cersey) Yeni zelandiya südlük cins yaratmışlar ki bu da həmin zona üçün əlverişsiz mühütə tez uyğunlaşan və yüksək yağlılığa malik heyvanlardır.

Dünyanın bütün bölgələrində demək olar ki,maldarlıqla məşğul olurlar Ancaq yüksək intensivlik həmin dövlətdə istifadə olunan cins tərkibindən və onun bəslənmə xüsusiyyətindən çox asılıdır. Dünyada 1,3 milyard baş qaramal vardır ki, bunun da çox hisəsi Hindistanda, Brasilyada, ABŞ-da yetişdirilir. Adam başına düşən qaramala görə ən çox yeni Zelandiya döflətidir, İrlandiya və Argentinada isə hər adambaşına iki baçdan artıq qaramal düşür. Kosta-Rika, Boloviya, Monqolustanda adambaşına bir qaramal düşür. Ancaq Azərbaycanda orta hesabla adam başına 0,25 - yəni 4 nəfər bir baş qaramal düşür.

Əgər dünya maldarlığının inkişaf tempinin son xülasəsinə aydınlıq versək məlumolar ki,son illərdə inkişaf etmiş ölkələr də südlük və ətlik qaramal cinslərin yaradılması və məhsuldarlığının yüksəldilməsi bilavasitə zebu əsasında yerinə yetiriliur. Bu baxımdan Azərbaycan maldarlığının cins tərkibini xarakterizə etsək məlum olar ki, respublikanmızda ətlik cins ümümi qramalın 0,5%-ni təşkil edir. Bu onunla bağlıdır ki, ətlik cinslərin yetişdirilməsi səmərəli olan zonalarda azlıq təşkil edir.

Əgər respublikamızın son 10 ilik heyvandarlıq məhsullarına və qaramalın cins tərkibinə görə xarakterizə etmiş olsaq məlum olar ki, 1995-ci ilə nisbətən ümumilikdə qaramalin baş sayı artmışdır ( 3% ) ,Ancaq ümumi naxır üzrə ana inəklərin miqdarı azlıq təşkil edir. Lakin 2008-ci il göstəricilərində isə qaramalın ümumi sayı artmış lakin ət və süd istehsalına görə 1995-ciildən az olmuşdur (7%). Eyni zamanda ana inəklərin xüsusi çəkisi artmasına baxmayaraq hər inəkdən sağılan süd 1110 kq-olmuşdur ki, buda 1995-ci il göstəricilərindən xeyli geridir.

Qaramalın ümumilikdə heyvandarlıq inkişaf tempinin belə aşağı olması səbəbi nə ilə bağlıdır. İlkin növbədə respublikamız ekstrimal şəraitli olduğu üçün zonalardan asılı olmayaraq və ya planlşdırılması nəzərə alınmadan hər bir təsərrüfatlara yəni Daşkəsən, Qazax, Şəmkir, Gəncə ətrafı, Astara, Salyan, Quba, Kürdəmir rayonlarına heç bir fərq qoyulmadan Qara-ala, Holştin cinsi toxum və ya törədicilərindən istifadə olunması töfsiyələnir. Müxtəlif zonalarda yetişdirilən bu cinslər öz genetik potensialını və uyğunlaşma qabiliyyətinin az olmasını nəzərə almadan cinslərdən istifadə olunur. Bu da heçdə müsbət nəticələnmır. Çünki yüksək mədəni cinslərin normal bəslənməsi üçün, onlar yemə tələbkar olduqları kimi, balanslaşmış yemlərin vacibliyi əsas sayılır. Eyni zamanda yüksək məhsuldar cinslərdə əgər bir gündə normadan 20% az

yemləndirilmə aparılsa onda sonrakı gün süd məhsuldarlığını 40-45% azaldacaqdır. Bu iə fermerlərə iqtisadi səmərə verməyəcəkdir. Mədəni cinslər respublikamızın iqlim şəraitinə çətin uyğunlaşmaqla bərabər ən çox qızdırma (qan parazitar xəstəliklərinə), vərəm, dabaq, bruselyoz, leykoz və dırnaq xəstəliklərinə tez tutulurlar. Bu da Azərbaycan respublikasına gətirilmiş (1954-1957; 1975-1978; 1984-1988) 100 minlərlə cins malqatranin məhf olması ilə nəticələnir. Ona görədə ancaq dünya təcrübəsinə əsaslanaraq cins yaratma üsullarına arxalanaraq (Hindistan-karanşvis; Afrika-bonsmara; Avstraliya – Avstraliya–frizi, zebu-südlük, mandolonq; Yamayka-yamayka-xoup, Kuba-siboney, Brazilya-Holland-qir: ABŞ-Braman, Santa-hertruda; Zelandiya-Yeni –Zelandiya və sair) yeni cins və tiplərin yaradılması zebu əsasında yerinə yetirilməlidir. Ancaq bu yolla qısa müddət ərzində hibridləşmə yolu ilə mühütə dözümlü tez yetişgənqaba yemlərdən səmərəli istifadə edən, yediyi yemi məhsula çevirə, uzunömürlü, xəstəliklərə tutulmayan naxırlar yaratmaq mümkündür. Məhz uzunmüddətli tədqiqatlarımızın nəticələrini şəkil və cədvəllər əsasında göstərməyimizi məsləhət bildik.

**Şəkil-1**



**Hibrid inəyi Allel-4791,I-nəsil.Yeni zelandiya X holştin X Simmental. I-doğum 305 gündə süd məhsuldarlığı 3770 kq, südə yağ 5,2%. Salyan r-nu. (Z,Tahirova)**



Hibrid buğası-3746, I-nəsil.
Yeni zelandiya X holiştin X Simmental. 25 aylıq canlı kütləsi 680 kq.(Z.Tahirova)

Yuxarıda qeyd edilənləri nəzərə alaraq respublikamızda südlük və ətlik naxırların yaradılması üçün ancaq a.ağıda göstərilən sxemlər əsasında dözümlü hibrid naxırlar yaratmaq mümkündür.S X E M İ-1



○ -Yerli mallar, Kostoroma, Qara-ala, Simmental

▨ -Kuba zebusu, Santa-hertruda

▩ - Siboney (Kuba),Yeni-zelandiya. Avstraliya zebu frizi

■ -Holiştin,Qara-ala.

░ -Aberdin-anqus, Limuzin

Yuxarıda göstərilən inək və buğa şəkillərindən aydın olur ki,alınmış hibridlər eksteryer göstəricilərinə görə ətlik-südlük cinslərinə çox yaxındır buda onu göstərir ki,nəsildə olan simmental cinsi öz genetik xüsusiyyətlərini daha çox biruzə verir.Eyni zamanda buxaq sallaqlığı və dərinliyi qulaq uzunluğu cinsiyyət ətəkləri üstünlüyü və süddə yağ faizinin yuxarı olması zebu qanın olduğunu əks etdirir.Yüksək südlülük və iri gövdəlik isə holştin cinsin xüsusiyyətini cəmləşdirmişdir.

Onuda qeyd etmək lazımdır ki,hibridlərin mühütə tez uyğunlaşması,heç bir xəstəliyə tutulmaası,yemlərdən yaxşı istifadə etməsi holiştin və simmental cinsindən çox üstündürlər. Ona görədə respublikamızda hər hansı cinsin yaradılması üçün sinaqdan keçirilmiş təcrübələr və dünya təcrübəsi əsasında aparılması daha məqsədə uyğundur. Hər hansı gətirilmiş cinslərin istifadəsi ancaq hibridlər əsasında yerinə yetirilməsi respublika maldarlığın adaha çox iqtisadi səmərə verər.

**İstifadə olunan ədəbiyyatlar.**

1. 1.Аббасов С.А. Гибридизация в условиях Азербайджана. Молочные и мясное скотоводства. М., № 4, 2002, с. 25-27.
2. 2.Аббасов С.А. Использование зебу для увеличения молочной продуктивности скота в Азербайджане. Международный сельскохозяйственный журнал. М., № 3, 2002, с. 60-61.
3. 3.Баширов Э.Б. Племенная работа- основа дальнейшей интенсификации животноводства // Наука Азербайджана Международный научно-теоретический журнал, Баку, 2006, №6-7 (13), с.43-59.
4. 4.Баширов Э.Б. Биологически хозяйственные особенности и племенное использование зебу, импортированных из республики Куба в условиях горной субтропической зоны Азербайджана в процессе адаптации // «Наука Азербайджана» Международный научно-теоретический журнал, Баку, 2006, №6-7(13), с.22-43.
5. 5.Буйная П.Н., Туринский В.М., Мокеев И.А. Использование зебу в

мясном скотоводстве // Зоотехния, 1999, №10, с.6-8.
6. 6.Левантин Д.Л.. Краткая аналитическая информация о развитии скотоводства и производстве молока и говядины в мире за период с 1990 по 1998 год // Молочное и мясное скотоводство, 2000, №3, с.30-31.
7. 7.Левантин Д.Л. Структурные изменения по использованию пород в скотоводстве // Молочное и мясное скотоводство, Москва, 2001, №1, с. 2-6.
8. 8.Лашкина Т. Пусть долго живет корова // Животноводство России, Москва, 2006, №10, с. 54-55.
9. 9.Рубенков А.А., Создание высокопродуктивных зебувидных молочных гибридов. Москва: Наука, 1991, 97 с.
10. 10.Тахирова З.А., Абилов А. Опыт использования для скрещивания новозеландского молочного зебу // Молочное и мясное скотоводство, 1989, №6. с.34-35.

## WORLD BASES OF THE DEVELOPMENT TEMPO OF THE CATTLE-BREEDİNG AND AZERBAİ"AN CATTLE-BREEDİNG

*Abbasov S.A. K/t.e.n.dosent:Azərbaycan Dovlət AqrarUniversiteti.*
*İlahəxanım Tofiq girl (daughter) .disertant island Mammad.*

World is/are clear from (the) experiment (experience) of the cattle-breeding that ekstrimal forbearing tezyetişgən to (the) condition, for slaughter and creation of the for slaughter and milk hybrids is possible soon to create desirable naxirlar with/by way (road, path) of (the) hybridizing dah səmərəlidir.Çünki in (the) zones of our republic using (used) from forbearing, brute forage (feed, fodder)s to illnesses well broadening hybridizing on the basis of zebu.

# CAMIŞ MƏHSULLARI XƏRÇƏNGİ MÜALİCƏ EDİR

***Camış məhsullarının insan sağlamlığına təsiri və bu baxımdan heyvandarlığın digər sahələri ilə bağlı bəzi problemlər haqqında***

**Əyyub BƏŞİROV**, *Azərbaycan Heyvandarlar Assosasiyasının prezidenti, Rusiya Beynəlxalq Keyfiyyət Problemləri Akademiyasının həqiqi üzvü, akademik*

Fiziki cəhətdən sağlam insan daha sağlam düşüncəyə, daha möhkəm əqidəyə sahibdir. Fikrimizi atalarımızın bir sözü də təsdiqləyir. Sağlam bədəndə sağlam ruh olar.

İnsan övladı ta qədimdən öz sağlamlığını qorumaq, onu möhkəmlətmək üçün müxtəlif yollar, vasitələr axtarıb, düşünüb, tapıb. O, bunların bir tərəfini fiziki hərəkətlərdə görübsə, digər tərəflərini təbiətdə, flora və faunada, özünün yetişdirmiş olduğu heyvanlarda arayıb.

Bu mənada, doğrudan da, heyvandarlıq sahəsi təbabətin, tibb elminin diqqətini çox çəkib. Çox saylı elmi araşdırmalar, dəyərli nəticələr əldə edilib. Bu günün özündə də elmi tədqiqatlar davam etdirilir.

Elmi qənaətlər sübut edir ki, ali məməli heyvanların orqanizmi fizioloji cəhətdən insan orqanizminə çox yaxındır. Bu səbəbdən də heyvanlar üzərində aparılan elmi-tədqiqatların nəticələri, bunların insan orqanizminə tətbiqinə, insan sağlamlığının qorunmasına, onun müalicəsinə geniş imkanlar yaradır.

Heyvanlar üzərində təcrübələr apardığım zaman həmişə düşünmüşəm ki, necə edim ki, heyvan tam sağlam olsun və ondan sağlam bala, eləcə də, sağlam, ekoloji təmiz, bioloji qiymətli qida əldə edə biləк. Buna nail olmuşam da. Həm də belə qənaətə gəlmişəm ki, heyvanın sağlamlığı üçün ən əsas amil bioloji qiymətli yemlə qidalanmadır. Bu amil eyni zamanda insan üçün də vacibdir. Digər amil isə təmiz hava və təmiz havada hərəkətdir. Ümumiyyətlə, canlı məxluq təbiətə yaxın olmalıdır.

Hər bir canlı təbiətin meyvəsidir. Gərək o, təbiətin qoynunda ola ki, onun istisindən, soyuğundan, küləyindən, dağından, çəmənindən, yağışından, qarından bəhrələnə bilə. Bütün bunlar insana ruh verən amillərdir. "Abu, atəş, badu , xak" - yəni su, od, hava, torpaq. İnsan və heyvan bu dörd ünsürdən, Allah tərəfindən xəlq edilib. İnsana uzun ömür, xoşbəxt həyat bəxş edən onu yaşadan bir də Allaha inamıdır. Allahın şah əsəri isə insandır. Ulu Tanrı ona öz əqlindən, məhəbbətindən pay da vermişdir. Əgər insanda böyük məhəbbət hissi varsa, o, bu dünyada cənnəti görəcək. İnsan öz ətrafında özünə mikroiqlim yaratmalıdır ki, bu onun sağlamlığına xidmət etsin. Cənnət nədir? Sular axır, ağaclar çiçəkləyir, meyvələr yetişir, bülbüllər oxuyur, hurilər qulluq edirlər. İnsanın özü də cənnəti bu dünyada yarada bilər.

Mən harada olmuşamsa, ağac əkib, bağ salmışam. Əfqanıstanda "Dostluq parkı" yaratmışdım. Gəncədə saldığım bağda ağaclar barlarının ağırlığından başlarını yerə əyirdi.

Mərdəkanda - həyətimdə əkdiyim 20 yaşlı tut ağaclarının yüz illik ağaclara bənzəri var. Hər nəvəmin adına bir tut ağacı əkmişəm.

Bu mənada insan həmişə çalışmalıdır ki, ətraf mühit, təbiət, ekoloji durum təmiz, əlverişli, cənnət timsallı olsun.

Məni həmişə bir məsələ, düşündürüb. Azərbaycanın indiki ekoloji mühitində sağlam heyvan yetişdirib, sağlam qida əldə edib insanların istifadəsinə vermək. Elə bütün həyatımı da bu məsələyə həsr etmişəm.

Çox təəssüf ki, bununla bağlı arzularımın, istəklərimin çoxunu müəyyən səbəblərdən gerçəkləşdirə bilməmişəm.

Xaricdə isə mənim məsləhətlərimdən bəhrələnərək özləri üçün nələr yaratmayıblar?! Hazırladığım texnologiyalardan istifadə edərək milyonlara sahib olublar. Öz ölkələrinin heyvandarlığında möcüzələr yaradıblar. Bolqarıstan, İtaliya, Fransa, Əlcəzair, Hindistan, Əfqanıstan, Çili kimi bir çox ölkələr bu günün özündə də həmin texnologiyalardan bəhrələnirlər. Bizdə isə...

Yer kürəsinin heç yerində olmayan ekoloji mühit Azərbaycanda mövcuddur. Bu da imkan verir ki, yüksək keyfiyyətli qida məhsullarından istifadə etməklə bioloji cəhətdən çox keyfiyyətli heyvanlar yetişdirək. Məsələn, elə camışı götürək. Mən onu yer kürəsinin qara mirvarisi adlandırmışam. Camış elə bir heyvandır ki, onun məhsulları ekoloji təmiz olmaqla, bioloji cəhətdən də çox qiymətlidir. Bədənə qan, can, sağlamlıq verir. Camışın məhsullarından daim istifadə edən insanlar çox enerjili, güclü olurlar. Yüksək enerji, sağlamlıq səbəbindən beyin də saat kimi işləyir.

Elə özümüzdən götürürəm. Biz uşaqlıqdan ailədə camış məhsulları ilə qidalanmışıq. Kəndimiz də, Neftçala rayonunun Xolqarabucaq kəndi bir vaxtlar Camışçılar adlandırılıb.

Camış çox qəribə, çox xeyirxah heyvandır. Bin-bərəkət dağarcığıdır desəm, yanılmaram. Həmişə kasıblara, hər şeyini itirmiş insanlara kömək durur. Öz məhsulları, ağartısı, əti ilə ona çörək qazandırır, Tanrının verdiyi ruzusun artırır. İnsandan isə heç nə istəmir. Camış özünə lazım olanları təbiətdən alır.

Azərbaycanda qamışlıqlarla və kol-kosluqlarla zəngin ərazilər çoxdur. Bu da camışçılığın inkişafı üçün ən vacib şərtdir, amildir. Vaxtı ilə Qafqazda, əsasən də Azərbaycanda **(85 faizdən çoxu - red)** milyondan artıq camış saxlanılırdı. İndi isə 300 min başa qədər camış var. Bu rəqəmi yenidən milyona çatdırmaq olar. Bunun da hesabına Azərbaycan əhalisini ekoloji təmiz, bioloji qiymətli yağ, süd, qaymaq, qatıq, pendir, ət məhsulları ilə təmin etmək olar. Camış ətində dəmir və fosfor həddindən artıq çox olduğundan birbaşa qana müsbət təsir göstərir. Çox vaxt mənə sual verirlər ki, camış əti nə üçün bərk olur? Əvvəla onu deyim ki, bu ətin qiyməti də elə bundadır. Tərkibindəki dəmirin çoxluğu ona möhkəmlik verir.

Camış ətinin lifləri arasında, başqa heyvanlarda olduğu kimi, piy qatı görməzsiniz. Camış ətində xolestrin də yoxdur. Camış radiasiyaya çox davamlıdır.

Camış südü digər südlərə nisbətən qida kimi daha qiymətlidir. Camış südü büsbütün (təmiz) vitamin A-dır. İnək südü karotindir. İnsanın qara ciyərinə saatlarla işləmək lazım gəlir ki, həmin karotini vitamin A-ya çevirsin.

Vitamin A isə sağlamlığın əsasıdır. Vitamin A qara ciyərdən qana keçir. Artığı isə ehtiyat kimi qara ciyərdə qalır. Bu vitamin gözü işıqlandırır, enerjini artırır, sağlamlaşdırır.

Camış südünün yağlılıq faizi inəyinkindən iki-üç dəfə artıqdır. Camışın südünün yağlılığı 8-12, inəyinki, isə 2,8 - 3,8 faizdir.

Camış südü həm də qiymətli mikroelementlər, minerallar və zülallarla çox zəngindir. Camışın ümmun sistemi çox möhkəm və güclüdür. Bu səbəbdən camış məhsulları ilə qidalanan insanların da immun sistemi möhkəmlənir. Bədənin, orqanizmin xəstəliklərə qarşı müqaviməti, mübarizə qabiliyyəti yüksəlir.

Görürsünüzmü, təkcə bir heyvan genefondunun timsalında, camışla Ulu Tanrı bizə neçə cür əvəzsiz nemət, şəfa, sağlamlıq, bin-bərəkət, dolanışıq mənbəyi verib!? Doğma yurdumuzun, Azərbaycanımızın hər qarışı, çöllərimiz, meşələrimiz, bağ-bağatlarımız, dağlarımız, bütövlükdə təbiətimiz, ekologiyamız, ekoloji mühitimiz haqqında bəhs etdiyimiz məhsulların əldə olunmasına böyük imkan verir. Bu məqamda soruşula bilər; bəs, necə olur ki, keyfiyyətsiz, yararsız, hətta insan orqanizminə, onun sağlamlığına ziyan verən, onun yaşamaq qabiliyyətinə, yaşam tərzinə zərbə vuran, bizə, mətbəxtimizə yad olan ərzaq məhsulları da dükan-bazara yol tapır?

Çox düşündürücü, doğru, yerində səslədirilən sualdır. Nə demək olar?! Bu məsələ hər şeydən öncə həmin sahəyə birbaşa rəhbərlik edən və cavabdeh olan insanlardan asılıdır.

Bu işə külli miqdarda vəsait, dövlətin davamlı dəstəyi, hüquqi baza, işlək mexanizm lazımdır. Dövlət başçısı bununla bağlı lazımi göstərişlərini verir.

Bir alim kimi mənim də heyvandarlığın inkişafı, eləcə də, konkret olaraq, bəhs etdiyimiz məsələ barədə təkliflərim, layihələrim var.

Bu gün "ərzaq qıtlığı" ifadəsi Azərbaycana yaraşmır. Çünki mövcud imkanlarımız buna əsas vermir. Təkcə camışçılıq sahəsinin imkanlarına nəzər yetirsək buna bir daha əmin olarıq.

Nəyə görə əsgərlərimiz, idmançılarımız, körpə və yeniyetmələrimiz, cavanlarımız camış məhsulları, yağlı, quyruqlu qoyun, arı məhsulları, balıq, qaz, ördək əti ilə qidalanıb daha da güclü, sağlam olmasınlar?! Nəyə görə donuz əti, konserv yeməlidirlər?!

İtaliyada hökumət camışın əhəmiyyətini nəzərə alaraq, ölkədə onun inkişafına yönəlmiş kompleks tədbirlər planı həyata keçirir. FAO-nun qərargahı da İtaliyada yerləşir. Orada sahibkarlara camışçılığı inkişaf etdirmək üçün pul vəsaiti verirlər. İtaliyada ilə 5-10 ton süd verən inəkləri ləvğ edirlər.

Əvəzində isə camışçılıq təsərrüfatları yaradılır. Axırıncı on illiklərdə camışçılıq 10 dəfədən də artıq inkişaf etdirilib. Halbuki, tarixçilərin şəhadətinə görə camış Avropaya Azərbaycandan keçib.

Amma bu gün camışçılığa münasibət bizdə heç də İtaliyadakı kimi deyil. Ögeydir. Hələ ötən əsrin yetmişinci illərində belə münasibət özünü daha qabarıq göstərmişdi. Başda Mərkəzi Komitənin ikinci katibi Kozlov olmaqla bir qrup məmur elə bil Azərbaycan camışına, camışçılığına qarşı səlib yürüşü elan etmişdilər. Xalqımızın bu qiymətli genefondu gözdən salınır, bəhərsiz, az məhsuldar heyvan kimi yeri gəldi, gəlmədi, inəklərin əvəzinə kəsilir, ətliyə verilirdi. Hətta camışçılığın ləvğ edilməsi barədə xüsusi qərar layihəsi hazırlanıb Mərkəzi Komitənin burosunda müzakirəyə çıxarılmalıydı. Bu bizim heyvandarlıq tariximizə, mədəniyyətimizə, xalqımızın sağlamlığına yönəlmiş bir qəsdin planı idi.

Camışın, camışçılığın qiymətini, dəyərini yaxşı bilən, xalqımızın, ölkəmizin mənafeyini hər şeydən üstün tutan ziyalılarımız Arif Mustafayev, Ağaxan Ağabəyli, İmran Əbilov, Surxay Tağızadə, Sadıq Murtuzayevlə birlikdə bu barədə xüsusi məktubla həmin illərdə respublikamıza rəşbərlik edən ümumilli liderimiz, mərhum prezident Heydər Əliyevə müraciət etdik. Bu məktubda camışçılığın üstünlükləri, səmərəsi, insan sağlamlığına xeyiri haqqında ətraflı məlumat verdik. Bundan sonra mərhum prezident həmin bədnam qərar layihəsininin büroya çıxarılmasına belə imkan vermədi. Bir daha bu məsələyə qayıtmağı qadağan elədi. Beləliklə, ümummilli liderimizin sayəsində böyük bir qəsdin qarşısı alındı.

Çox təəssüf ki, belə ziyanlı tendensiyalar indi də özünü göstərir. Belə ki, yerli mal-qara, camış genefondlarının cins tərkibinin süni mayalama vasitəsi ilə hibridlərin yaradılması ilə yaxşılaşdırılması, məhsuldarlığın artırılması əvəzinə, Avropanın kəskin fərqli ekoloji mühitdə, şəraitdə yetişdirilmiş südlük inək cinsləri, yüksək süd məhsuldarlığı var, şüarı altında öz ölkəsində inək quduzluğu xəstəliyinə səbəb olduğundan tələf edilən mal-qaranın gətirilməsinə rəvac verilir.

Bu heyvanlar respublikamızın ekologiyasına uyğun gəlmir. İnsan və heyvanlar arasında ağır xəstəliklər, vərəm, brüsellyoz, leykoz, xərçəng kimi bəlalar yayırlar. Öz məhsulları ilə insan orqanizminə, sağlamlığına ziyan verir, zəhərli preparatlarla çimizdirildiklərindən ekologiyanı çirkləndirirlər. Həm də həmin zəhərli preparatların həmin heyvanların ətinə, qanına, südünə keçməsi səbəbindən insan orqanizmi də zəhərlənmələrə, xəstəliklərə düçar olur.

Bu heyvanların çoxunun gətirildikdən az müddət sonra süd məhsuldarlığı kəskin surətdə aşağı düşür. Qısırlıq faizi yüksəlir. Yerli şəraitə uyğunlaşmamaq, xəstəliklər səbəbindən də kütləvi surətdə qırılırlar. Bunlar bir yana. O biri tərəfdən isə bu heyvanların gətirilməsinə, saxlanılıb bəslənməsinə külli miqdarda vəsait xərclənir. Ümumi götürdükdə isə bu işlərin xərci borcunu ödəmir, çəkilən zəhmət boşa gedir. Bunlara rəğmən həmin cinslər yenə gətirilir. Niyə? Bax, bu sual düşündürücüdür.

Çox təəssüf ki, böyük bəlalara və külli miqdarda maliyyə xərclərinə səbəb olan bu zərərli İş Respublika Kənd Təsərrüfatı Nazirliyinin Heyvandarlıq İdarəsinin rəisi Çingiz Fərəcov başda olmaqla, bir qrup məmur tərəfindən görülür.

Hələ bunlar azmış kimi, həmin məmurlar tərəfindən donuzçuluğun inkişafı perspektivlərindən, donuzun xeyirli heyvan olmasından bəhs edilir, bu heyvanın xeyiri, səmərəsi təbliğ olunur. Ulu Tanrının da xoşlamadığı və haram buyurduğu, milli mentalitetimizə, milli mətbəximizə, heyvandarlıq mədəniyyətimizə, ən nəhayət, dinimizə yad bir heyvanın müsəlman ölkəsində, Azərbaycanda, təbliğ olunması nə dərəcədə doğrudur?! Özü də dünyanın donuz qripindən həzər etdiyi bir vaxtda!!! Absurd, həm də eyib olan iş!

Əslində bu heyvan çox ziyanlıdır. Donuz siçovul, siçanlar kimi insanlar və heyvanlar arasında sürətlə xəstəliklər yayan heyvandır. Donuz əti bioloji cəhətdən ən aşağı keyfiyyətli, ən aşağı qiymətli və xəstəlik mənbəyidir.

Təəssüflər olsun ki, həmin məmurlar belə bir ziyanlı sahənin inkişafına üstünlük verdikləri halda, hər cəhətdən əvəz olunmaz, hətta, qoy elə bunu da deyim, öz yeli və kərməsi ilə də xeyir verən camışın, olduqca səmərəli sahənin, camışçılığın tərəqqisinə açıq-aşkar mane olurlar. Bütün bu zərərli tendensiyalar barədə Azərbaycan Heyvandarlar Assosasiyasının çaldığı həyəcan təbili eşidilsə də, nə yazıqlar ki, qulaq ardına vurulur!!!

Dünya genefondundan Azərbaycanda səmərəli istifadə etməklə yalnız heyvandar alim və bioloqların, baytar alimlərin, respublika damazlıq sistemi mütəxəssislərinin məsləhətləri, layihələri əsasında yerli şəraitimizə, ekologiyüamıza uyğun, xəstəlklərə davamlı, yeni, yüksək məhsuldar südlük-ətlik qaramal cinslərinin, hibrid cinslərinin yaradılması məqsədilə rekord döllük buğaların dondurulmuş toxumlarını gətirib süni mayalanma aparmaq lazımdır. Bu yolla alınan cinslərin damazlıq təsərrüfatları yaradılmalıdır. Bu baxımdan Qolştinfriz, Cerzey, zebu və zebu hibridləri daha məqsədə uyğundur.

Mən deyərdim ki, camışçılıq heyvandarlığızın ana xətti, şah damarıdır. Səmərəsinə, xeyrinə, camışın bir məxluq kimi fizioloji, bioloji cəhətdən təkzib olunmaz üstünlüklərinə, hətta xeyirxahlığına görə belə deyirəm. Bu mənim həyatım boyu apardığım müşahidələrin, elmi araşdırmaların, tədqiqatların nəticəsində gəldiyim qənaət, möhkəm əminlikdir. Məni tanıyanlara da bəllidir ki, bu sahənin çobanı da olmuşam, alimiyəm də! Camışın binin-bərəkətini qoyuram bir yana, şəfavericiliyini isə öz canımda hiss etmişəm, görmüşəm.

Deyəndə ki, camış məhsulları xərçəngi müalicə edir, çoxları təəccüblənir, inanmaq istəmirlər.

Bunun elmi həllini isə birinci öz üzərimdə tapmışam.

Mən, tibb elmimizin iki böyük nümayəndəsinə, akademik Cəmil Əliyevə və professor Nurəli Əfəndiyevə ömrüm boyu minnətdaram. Onlar mənim həyatımın ən ağır məqamında xilaskar kimi yanımda dayandılar.

Vaxtilə gicgahımda şiş xəstəliyi olub. 1964-cu ildə Moskvada professor Nurəli Əfəndiyev üzərimdə əməliyyat apardı. Sonralar görkəmli akademik

Cəmil Əliyev tərəfindən 1979-cu ildə təkrar əməliyyat olundum. Xəstəlik artıq kök atdığı üçün sağalması çox çətinlik yaradırdı. Həkim də mənə dedi ki, əməliyyata çox gec gəlmisən. Mən gülüb cavab verdim ki, neynək, onu özüm əridərəm. O vaxtdan bəri 30 ildən çox vaxt ötüb. Mən özümü indi - 83 yaşında daha yaxşı hiss edirəm. Çünki qidalanmanı düzgün aparmışam. Qidalanmanın da əsasını camış və arı məhsulları təşkil edib. Onu göy-göyərti, meyvələr, soğan, sarımsaqla daha da zənginləşdirmişəm. Qidalanma orqanizmi sağlam saxlamaq, xəstəlikləri müalicə etmək üçün ən vacib şərtdir. Qidalanma böyük elmdir. Bişmiş yağlar, ağ çörək, nişasta, şəkər bədənə xılta verir. Bunlar da orqanizmdən xaric olunmayan bəlğəm yaradır. Maraqlıdır ki, inək südü də bəlğəm əmələ gətirir. Camış məhsulları isə bu xəstəlikləri aradan qaldırır. İnək özü vərəm, brusellyoz, leykoz kimi ağır xəstəliklərə tutulduğu üçün bu xəstəlikləri digər heyvanlara, həmçinin insanlara keçirir. Camış məhsulları ilə qidalanan adamlarda nə vərəm, nə xərçəng, nə də leykoz olur. Təcrübələrim bunu sübut edib. Mən 17 yaşıma qədər vaxtaşırı qarın üstündə ayaqyalın gəzmişəm. Camış məhsullarının verdiyi enerji məni hər cür xəstəliklərdən hifz edib. Qidalanmanın qızıl qaydası - acmamış süfrəyə əl uzatma, doymamış əlini süfrədən çək, - qaydasına riayət etmək insanın uzunömürlülüyünə yol açır. Az, lakin keyfiyyətli yemək, qidanı kifayət qədər çeynəyib udmaq lazımdır. Mədəni gücə salmaq olmaz. Axı, onun dişi yoxdur! Ağızın lığabı qidanın həzm olunmasında həlledici rola malikdir.

Həzm prosesini yaxşılaşdırmaq üçün də xüsusi qaydalara riayət etmək lazımdır. Yeməkdən yalnız 2 saat sonra çay, yaxud su qəbul etmək olar.

İnsanın sağlamlığına müsbət təsir edən amillərdən biri də daim hərəkətdə olmaq və təmiz hava qəbul etməkdir. İndi bəzi xəstəlikləri Amerikadan gətirilmiş oksigenlə müalicə edirlər. Abşeron dənizin sahilində yerləşməklə dəniz səviyyəsindən 30 metr aşağıda dayanır. Bura cənnətdir. Biz əslində oksigen balonunun içərisində yerləşirik.

YUNESKO-nun və İSESKO-nun xoş məramlı səfiri, millət vəkili Mehriban xanım Əliyevanın "Hərəyə bir ağac əkək!" təşəbbüsü Azərbaycanda ekoloji mühitin qorunması istiqamətində düşünülmüş çox mühüm bir tədbirdir. Hamı ona əməl etsə, ölkəmiz gülüstana çevrilər.

İnsan gün ərzində bacardıqca çox hərəkət etməlidir. Yaşlaşdıqca hərəkətlər daha da artırılmalıdır. İndi 83 yaşımdayam. Özümdən qat-qat cavan adamlarla güləşib, üzüb, qaçıb, qalib gəlməyə hazıram.

***Е.Б.БАШРОВ**, Президент Ассоциации Животноводов Азербайджана, академик*

# МЕРОПРИЯТИЯ ПО ИНТЕНСИВНОМУ РАЗВИТИЮ И КОРЕННОМУ КАЧЕСТВЕННОМУ УЛУЧШЕНИЮ ПЛЕМЕННОГО ЖИВОТНОВОДСТВА АЗЕРБАЙДЖАНА

**Мероприятия по коренному улучшению и интенсивному развитию племенного животноводства в хозяйствах Азербайджана**

**Утверждаю Приказом Госагропрома**
**Азербайджанской ССР**
**От 01.04. 1987 г. № 1943**

**Баку - 1987 г.**

| №№ Наименование мероприятия | Срок исполнения | Исполнители | Отметки о выполнении |
|---|---|---|---|
| 1.0. Разработать по отдельным зонам республики программу качественного совершенствования скота с учетом породного районирования, зональных особенностей и направлений специализации отрасли. | 1987-88 гг. | Аз.СХИ, АзНИИЖ, Академия наук азерб.ССР, Племупр. племсовет управл. Животноводства, отдел живпром. | |
| Для этого:<br>1.1. Обеспечить во всех племхозяйствах и племфермах составление и утверждение планов селекционно-племенной работы за 1987-1995 г. Особое внимание обратить на налаживание образцового племенного учета | 1987-88 гг. | Племслужба республики Аз.НИИЖ | |
| 1.2. Создать и утвердить Республиканский племсовет | 1987 г. | Племслужба республики Аз.НИИЖ | |
| 1.3. Разработать и представить на утверждение новый план породного районирования | 1987-88 гг. | Аз.СХИ, АзНИИЖ, Академия наук азерб.ССР, Племупр. племсовет управл. животноводства, отдел живпром. | |
| 1.4. Активизировать деятельность племенной службы в направлении существенного улучшения организации воспроизводства стада, рационального использования ресурсов племенного скота, значительного увеличения выхода молодняка на 100 маток и повышения уровня его выращивания, четкой | 1987-88 гг. | Управление по племделу, служба рук.район. хоз-в. | |

| | | | |
|---|---|---|---|
| организации искусственного осеменения маточного поголовья крупного рогатого в хозяйствах низменной и предгорной, а также расширение зоны его применения в овцеводстве. | | | |
| 1.5. Разработать и осуществить порядок завоза и размещения племскота внутри республики с четким определением хозяйств, куда будет завозиться племскот, количества и качества скота, и задач завоза, установить строгий контроль за качеством завезенного и заготовленного на месте племскота, ветеринарным состоянием и дальнейшим использованием его. | 1987-90 гг. | Племуправл.управ.ветерин.управ. животн.РАПО и хозяйств. | |
| 1.6. Принять действенные меры по обеспечению райплемобъединений помещениями укомплектовать их квалифицированными кадрами. | 1987-89 гг. | Руковод. РАПО. Госагропром республики, Нах.АССР, НКАО | |
| 1.7. Улучшить работу по подготовке и переподготовке работников племенной службы, повысить их квалификацию и профессиональное мастерство в целях овладения ими прогрессивными методами селекции и воспроизводства стада. Провести аттестацию | 1987-88 гг.<br><br>1988 гг. | Главное управ.кадров и внешних связей по произв. и перер. продукт.животноводства<br><br>Главное управ.кадров и внешних связей учебн.комбинта управ. по племделу. | |

| | | | |
|---|---|---|---|
| специалистов республиканской племслужбы, укрепить ее квалифицированными кадрами. Организовать 2-месячные курсы постоянно действующие по подготовке и переподготовке специалистов по селекции и искусственному осеменению сельхозживотных в школе повышения квалификации при учебном комбинате Госагропрома Азерб.ССР | | | |
| 1.8. Провести аттестацию всех племхозяйств и племферм, инвентаризацию племскота, особенно маточного поголовья, определить их качественный состав, продуктивность и воспроизводительную способность, обеспечить выбраковки малопродуктивного скота. | 1987-99 гг. | АзСХИ, АзНИИЖ и-т кормов АН Аз.ССР Главное управ. по произ. и перер.прод. животноводства | |
| 1.9. В связи с переходом хозяйств на полную хозяйственную самостоятельность возложить всю полноту ответственности за состояние искусственного осеменения в животноводстве, воспроизводстве стада, эффективность селекционно-племенной работы на руководителей и | Постоянно | Соответ.подразд.Госагропр.Аз.ССР, науч-исслед. Учрежд. РАПО и хоз-ва. | |

| | | | |
|---|---|---|---|
| специалистов колхозов совхозов. Племпредприятием, научно-исследовательским учреждениям систематически оказывать хозяйствам помощь в организации этой работы | | | |
| 2.0. В целях укрепления связи науки с производством: | | | |
| 2.1. Разработать и представить предложения создании на базе ЦСИО и Абшеронской опытной станции по животноводству научно-производственного центра по генетике, селекции с включением в его состав семени банка, генобанка, лаборатории имунногенетики, трансплантации зигот, элеверов по выращиванию и реализации рекордных, баранов буйволов и зебу. | 1987-88 гг. | Соответствующие Главки Госагропрома Азерб.ССР | |
| 2.2. Обеспечить выполнение пункта « постановлений ЦК КПСС и Совета Министров СССР от 12.12.86 г. №1472 и ЦК КП Азербайджана и Совет Министров республики от 10.02.87 г. «70 «О создании РПНО - «Азерплемобъединение» с включением в его став селекционного центра АзНИИЖ, племенных хозяйств ЦСИО, | 1987 г. | Госагропром Аз.ССР | |

| | | | |
|---|---|---|---|
| лаборатории трансплантации и других (иммуногенетических и др.) | | | |
| 2.3. Обеспечить в установленном порядке строительство производственных и бытовых объектов селекционного центра пос. Пиршаги Абшероснкого района | 1987-90 гг. | Глав.управ.по произв. и перераб.продук.живот.кап.строит. и рекон. мат-тех.снабжен. | |
| 3.0. Обеспечить к 1990 г. расширение сети племенных заводов и племенных хозяйств (согласно приложения №2 пост.№70 от 10.02.87 г.) повысить их роль в развитии племенного животноводства, ориентировать их производственную деятельность на получение, выращивание и реализацию высококачественного племмолодняка. Считать необходимым довести продуктивность дойного стада до 3500 кг молока на 1 корову , среднесуточные привесы крупного рогатого скота на выращивание до 600 г. Настриг шерсти на 1 овцу до 4 кг. Для чего: | 1987-90 гг. | Главн.управ. по произ. и перер.продук.животн. план и соц.разв.кап.строит. и рек. Мат-тех, снабжен.РАПО хоз.АзНИИЖ, АзСХИ, Аз.НИВИ хозяйства | |
| 3.1. Организовать по согласованию с министерством хлебопродуктов Азерб.ССР для высокопродуктивных животных производство специализированных комбикормов по научно- | 1987-90 г. | Глав.управ.по произ. и перер.пр.животноводства науки и пропаг. Минхлебопродук. (к пунктам 4, 5 и 6) | |

| | | | |
|---|---|---|---|
| обоснованным рецептам для обеспечения ими государственных племзаводов, племпредприятий и контрольно-испытательные станции | | | |
| 3.2. Предусмотреть в планах экономического и социального развития выделение племенным заводам и хозяйствам капитальные вложения и материальные ресурсы в объемах, обеспечивающих строительство необходимых объектов производственного и культурно-бытового назначения, создание прочной кормовой базы, оснащение высоко-производительной сельхозтехникой, оборудованием и другими материально-техническими средствами. | 1987-88 гг. | | |
| 3.3. Пересмотреть план селекционно-племенной работы племхозяйств и племферм на 1988-90 гг. и до 1995 г. Обеспечить комплектование вновь созданных племзаводов высокоценным поголовьем, наладить в них работу (создание линии, семейств, дочерних хозяйств, племядра и др.). Направляя их основную деятельность на всемерное повышение продуктивности животных, выращивание и реализацию высокоценного | 1987-88 гг. | РАПО Аз.НИИЖ, Аз.НИВИ, племслужба | |

| | | | |
|---|---|---|---|
| племмолодняка. Разработать и внедрить в них научно-обоснованную систему выращивания племмолодняка | | | |
| 3.4. Выделить предприятиям и организациям по племенному делу и искуственному осеменению, центру по трансплантации эмбрионов сельскохозяйственных животных ежегодно по 20 штук легковых автомобилей повышенной промости (УАЗ-3151) | 1987-90 гг. | Главное управ.мат-тех. по снабж.план и экон.развитию Гос.Азерб.ССР | |
| 3.5. Укрепить племенную базу буйволоводства. Внести предложение по созданию племенных буйволоводческих хозяйств и ферм наладить зоотехнический учет в буйволоводстве отдельно от красного стада. | | Глав.управ.по произ. и перер.прод.живот. ЦСУ РАПО и хозяйства | |
| 4.0. Сосредоточить внимание на оценке производителей по качеству потомства С этой целью: | 1988 г. | Глав.управ.по произ. и перер.прод.живот. Главное управление науки | |
| 4.1. Согласовать с Министерством финансов Азерб. ССР порядок и источники покрытия расходов предприятий и организаций по племенному делу, связанных с проверкой плempроизводителей по качеству потомства Разработать цены на семя проверенных | 1988 г. | Глав.управ.по произ. и перер.прод.живот. кадров и внеш.связей науки и пропаг.соц. и экон.развития | |

| | | | |
|---|---|---|---|
| производителей в зависимости от их племенных качеств и внести в Совет Министров на утверждение по согласованию с Госагропромом СССР. | | | |
| 4.2. Разработать и утвердить рекомендации по оплате труда работников, занятых искусственным осеменением коров и телок в колхозах и совхозах Аз.ССР, с целью установки общего фонда заработной платы осеменаторов в зависимости от числа обслуживаемого маточного поголовья выхода приплода телят | | | |
| 4.3. Организовать прогрессивные организационные формы воспроизводства и искусственного осеменения межхозяйственные кольцевые маршруты для охвата искусственным осеменением коров и телок на небольших фермах и внутрихозяйственные (бригады специалистов по воспроизводству на крупных фермах более 500 коров и телок случного возраста) и комплексах | 1987-89 гг. | Госагропром Аз.ССР РАПО и племслужба | |

| | | | |
|---|---|---|---|
| 4.4. Организовать ежегодное проведение межрайонных конкурсов профессионального мастерства техников-осеменаторов, выпуск плакатов о выходе приплода по районам Первый республиканский конкурс провести техников-осеменаторов в 1988 году. | 1988 г. | Госагропром Азерб.ССР племслужба, РАПО, АзНИИЖ, АзНИВИ | |
| 5.0 Расширить объемы работ по скрещиванию молочного скота черно-пестрой породы с голштинофризским скотом и их помесям с кровью зебу (прил. 1 к прик. №488 от 10.-5.87 г. Госагропром Азерб.ССР/ и бурых пород с быками швицкой породы молочного типа американской и австралийской селекции). Осуществить осеменение маточного поголовья черно-пестрой породы семенем голштинофразских быков в 1987 г. – 15 тыс., 1988 г. – 15 тыс., 1989 г. – 20 тыс., 1990 г. – 20 тыс. голов Начать работу по выведению Азербайджанского черно-пестрого и бурого молочного скота с годовым удоем соответственно 4500-4200 кг молока от коровы | 1988 г. 1987-90гг. | Племслужб. Селек.зоотех. научн.исслед. учреждения | |

| | | | |
|---|---|---|---|
| 5.1. Обеспечить дальнейший рост производства говядины за счет внедрения интенсивных технологий выращивания и откорма скота в колхоза и совхозах Начать работы по созданию новых типов мясного скота на основе скрещивания местных пород с быками зебу, галловейской, абердино-ангусской и др.мясных пород | 1987-90 гг. | Управ.живот.управ. по племделу, район.плем.служба, РАП, научно-исследов. учрежд.хоз-в. | |
| 6.0. Предусмотреть, наряду с качественным преобразованием буйволов, увеличение численности поголовья их, особенно маточного на 20% больше к 1990 г. сравнительно с 1987 г. Развивать буйволоводство в 2-х направлениях: молочном и мясном (с суточным удоем выше 5 кг и жир. 8-9% в молочном, в мясном – повышения скороспелости). Создать на этой базе 2 типа Азербайджанской породы буйволов. | 1987-90 гг. | те же соответ.подразд. Госар.Азерб.ССР | |
| Широко развивать буйволоводство в личных и подсобных хозяйствах, организовать продажу плембуйволов для обеспечения хозяйств колхозников, рабочих и служащих и др. | 1987-90 г. | племслуж. кол.совх.пром.пред.РАПО, хозяйства | |

| | | | |
|---|---|---|---|
| 7.0. Расширить объем 2-3-породной гибридизации в свиноводстве, селекционное стадо свиней, сосредоточить в основном в племенных хозяйствах на фермах и комплексах (крупная белая, Сев.кавказ. Ландрас), Основными материнскими породами считать крупную белую. Произвести высокопродуктивный гибридный молодняк в 1987-90 гг. 22 тыс. гол., в т.ч. 15 тыс. голов для целей воспроизводства. | 1987 -18 тыс. год, 1988 г. -19, 1989 г. – 21, 1990 г. -22 | Плем.служ. РАПО, свиноводческие хозяйства | |
| 8.0. Повысить эффективность селекционной работы в овцеводстве. Создать две новые породы овец – Азербайджанская мясошерстная с тонкой и полутонкой шерстью и Азербайджанская жирнохвостная мясошерстная с полугрубой и грубой шерстью. Поголовье маток в товарных хозяйствах, улучшаемых баранами отечественной и зарубежной селекции довести до 700 тыс. голов в 1990 г. Увеличить зону распространения карадолакского отродья Карабахской породы овец, овец Гала-Абшеронская, создать новые племзаводы племхозяйства и племфермы по разведению Балбасской, Карабахской, | 1987-90 гг. | Плем.служба, науч.исслед.учрежд.РАПО и хозяйства | |

| | | | |
|---|---|---|---|
| Абшеронской (Гала) и др.породы овец. | | | |
| 9.0. Улучшить поголовье лошадей в колхозах и совхозах производителями заводских пород, совершенствовать местные породы:: - Карабахская, Дилифозская путем сохранения их уникальных особенностей высокой приспособленности к специфическим условиям зон разведения Совершенствовать верховые породы спортивного направления путем чистопородного разведения и скрещивания чистокровной верховой и арабской пород. | 1987-90 гг. | плем.служб.научн-исслед.институт, учредж.РАПО и хозяйства | |
| 10. Обеспечить безоговорочное выполнение разработанной управлением по племенному делу программы качественного совершенствования сельхозживотных, утвержденной приказом Госагропрома Азербайджанской ССР от 10 мая 1987 г. №488. | 1987-90гг. | Соответ.подразд. Госагропрома Аз.ССР. | |

**Начальник управления по племенному делу**

**Э.БАШИРОВ**

**Jurnal Azərbaycan Respublikası Ədliyyə Nazirliyində Dövlət qeydiyyatından keçmişdir.**

**Qeydiyyat nömrəsi 2212**

**Redaksiyanın ünvanı:**

Bakı, Mətbuat prospekti, 529-cu məhəllə,

«Azərbaycan» nəşriyyatı, VI mərtəbə.

**Telefon: (012) 510-63-99,**

**(050) 359-86-09, (055) 738-58-83, daxili: 5-09**

Texniki redaktor: **OQTAY ORUCOV**

**Texnikabank ASC**

**Kapital filialı h/h 38210006310001**

**VÖEN 6200060022**

Yığılmağa verilmişdir: 2.09.2009

Çapa imzalanmışdır: 5.10.2009

Kağız formatı: 60x84 1/16

Mətbəə kağızı № 1

Tiraj: 200, Sifariş: 088

Qiyməti: Müqavilə ilə

***Jurnal «Yeni Poliqrafist» MMC-nin***

***Mətbəəsində Rizoqraf üsulu ilə çap olunmuşdur.***

***Telefon: 422 59 18, 423 70 51.***